*Bu kitab “**Cabir Novruz.** Seçilmiş əsərləri”*
*(2 cilddə, Bakı, Yazıçı, 1983) nəşri əsasında*
*təkrar nəşrə hazırlanmışdır*

Ön sözün müəllifi: **Müşfiq Cabiroğlu**

**894.361’1 - dc 21**
**AZE**
**Cabir Novruz. Seçilmiş əsərləri**. Bakı, “Lider nəşriyyat” 2004, 288 səh.

Kitaba lirik şair Cabir Novruzun yarım əsrlik yaradıcılığı müddətində qələmə aldığı seçilmiş şeirləri, “İnsan hünəri” və “Azərbaycan” poemaları daxil edilmişdir. Şeirlərdə şairin həm incə, kövrək lirik duyğuları, həm də ümumbəşəri və milli ağrılardan doğan vətəndaş-şair narahatlığı əks olunmuşdur.

**ISBN 9952-417-10-X**



Azərbaycan Respublikasının Prezidenti
İLHAM ƏLİYEVİN
**“Azərbaycan dilində latın qrafikası ilə kütləvi nəşrlərin həyata keçirilməsi haqqında”**
12 yanvar 2004-cü il tarixli sərəncamı ilə nəşr olunur və ölkə kitabxanalarına hədiyyə edilir



## MƏNİM ÖLMƏZ ŞEİRLƏRİM…

***Cabir Novruz***

Ölməz Füzulinin eşqilə şeirə gələn, Nəsimi taleyini özünə həyat amalı seçən Sabirdən həqiqəti əxz edərək “həqiqəti deyən adam güclü olur” söyləyən, 29 yaşında gedər-gəlməzə göndərilən Müşfiqdən nakamlığı öyrənən Cabir Novruz Azərbaycan poeziyasında özünəməxsus cığır açaraq əbədilik qazanıb. Xalq şairi Cabir Novruzun sağlığında xeyli kitabları işıq üzü görüb. Bir oxucu olaraq bütün bu kitabları övladlarım qədər çox istəyir, göz bəbəyim kimi qoruyuram, onları dəyərli qələm sahibinin mənəvi heykəlləri hesab edirəm.

Taleyin qisməti elə gətirib ki, şairin “Seçilmiş əsərləri” kitabını həm redaktə, həm tərtib etmək, həm də ön sözün müəllifliyi mənim payıma düşüb. Mən bu işdən böyük fəxarət hissi duyuram. Cabir Novruz kimi qüdrətli şairin (atam olduğuna görə demirəm) kitabını araya-ərsəyə gətirmək ədəbiyyat tariximizin səhifələrinə düşmək deməkdir.

Yarım əsrlik yaradıcılıq yolu keçmiş Cabir Novruzun yeni kitabına toplanmış nümunələr ədibin yaradıcılığından qırmızı xətt kimi keçir. Heç şübhəsiz ki uzun illər xalqımızın dilində əzbərə çevrilmiş “Mənim nəslim”, “İnana bilmirəm”, “Sağlığında qiymət verin insanlara”, “Mənim ölməz şeirlərim” və başqa şeirlər Cabirsevərlərin ürəyini oxşayacaq. Amma həyatın faniliyinə bax kı, bütün bunlar onsuz baş verir. Oxucular bu kitabı görəndə nə qədər sevinəcəklərsə, bir o qədər də kədərlənəcəklər. Onun yoxluğu ilə barışmayan minlərlə oxucu şeirləri oxuyanda qəlblərində bir daha Cabir Novruz nuru, sönməz işığı yanacaq. Bir daha əmin olacaqlar ki, Cabir Novruz şeiri bəşəridi, həmişəyaşardı.

***Müşfiq Cabiroğlu***

## MƏNİM NƏSLİM

Mən dövlətli ailədə doğulmadım,
Şan-şöhrətli ailədə doğulmadım.
Ən adicə bir insandı atam mənim,
Zər-xaralı yataqlarda yatammadım.
Məst olmadım incə, zərif qucaqlarda,
Boy atmadım meydan-meydan otaqlarda,
Mən doğuldum payız yerə qəm yazanda,
Bu dünyanın ən balaca komasında,
Heç yer üzü gözləmirdi bəlkə məni,
Mən doğuldum... Bürüdülər kürkə məni,
Yatırtdılar bir küncündə komamızın.
Qoca nənəm lay-lay dedi uzun-uzun.
Min bir cürə naz-nemətdən uzaq oldum,
Nə də hazır səadətə qonaq oldum,
Boz inəkdən süd sağaraq hər gün səhər,
Qaynatmayıb buğlu-buğlu içirtdilər.
Gözüm dağa-daşa baxdı, heyran oldu,
Yazda-yayda mənim qəhvəm ayran oldu.
Qışda şaxta kəsdi məni nizə kimi,
Payız gəldi, palçıq gördüm dizə kimi.
Bir gün dərdlər komamıza güc elədi,
Bir gün atam bu dünyadan köç elədi,
Atam getdi, məni qoydu mənim üçün,
Var-dövləti elə buydu mənim üçün...
Atam itdi arzuların dumanında,
Mən tək qaldım sərt taleyin amanında.
Tale bir yol insaf nədir bilmədi heç,
Bir çöpü də asanlıqla vermədi heç.
Məni yüz yol döyəclədi, şilləl

ədi.
Neçə-neçə xoş arzumu şil elədi.
Nəyim varsa, zaman-zaman tək qazandım,
Məhəbbətdən qaşığacan tək qazandım.

Qazanmadım səadəti xoş ilə mən,
Yox, qazandım dırnaq ilə, diş ilə mən.
Bu ömürçün, bu həyatçın necə varam,
Bax, o çətin günlərimə minnətdaram.

Mən arxalı, mən nəsilli doğulmadım,
Ancaq heç vaxt çəkinmədim, sıxılmadım.
Anam bir az bundan ötdü dərd elədi,
Çox vaxt bizi pis adamlar pərt elədi,
Məni bu cür doğulmağım sərt elədi,
Məni bu cür doğulmağım mərd elədi.
Qəlbi təmiz saxladı bu,
Məni yerlə, məni göylə bağladı bu.
Söyləyimmi, qohumlarım nəçi idi,
Xarrat idi, çoban idi, suçu idi.
Minnətdaram öz nəslimə buna görə,
Axdı mənim taleyimə gilə-gilə.
Həmin sadə adamların cəh-cəhləri,
Taleləri, ömürləri, ləhcələri.
Mən özümə, bax, onları nəsil seçdim,
Sərt taleli insanları nəsil seçdim,
Bu həyatı duyanları nəsil seçdim,
Daş üstə daş qoyanları nəsil seçdim.
Bu gün elə düz işimdə, ya səhvimdə,
Mən onların, onlar mənim tərəfimdə...
Nə vaxt ömür yollarında karıxıram,
Dolaşıram, çəkinirəm, darıxıram,
Nə zaman ki, ömür coşur, dalğa olur,
Mənə elə sərt taleyim arxa olur...
Kim deyir ki, xoşbəxt olmaq asan işdir?
Yox, zor işdir, çətin işdir, yaman işdir!

Hələ çoxdur bu yolların əziyyəti,
Kim deyir ki, bu həyatla döyüşmürəm?
Diş-dırnaqla qazandığım səadəti,
Min-min hazır səadətə dəyişmərəm.

## SİZ QALSANIZ, BƏSİMDİR...

Misralarım, sözlərim,
ən mehriban kəslərim...
Doğma torpağım qədər
doğmam, müqəddəslərim...
Sizdən özgə mənimçin
hər nə var əfsanədir...
Dövlət, var əfsanədir,
Şöhrət, şan əfsanədir,
Sizdən ayrı mənimçin
bu cahan əfsanədir.
Mənim adım, familim
hər vaxt üstünüzdədir.
Bütün gücüm, qüdrətim
zəifiliyim sizdədir...
Heç zaman uçulmayan
qalamsınız siz mənim...
Atamsınız siz mənim,
balamsınız siz mənim...
Sizə yaxınlaşanda
görürəm ki, güclüyəm.
Sizdən uzaqlaşanda
görürəm ki, heç nəyəm...
Sizə yaxınlaşanda
görürəm qüvvətliyəm,
müqəddəsəm, uluyam.
Sizdən uzaqlaşanda
görürəm ki, çox adi
fikirlərin quluyam.
Mən olmasam, nə eybi,
siz varsınız, bəsimdir,
Məndən xatirə kimi
qalarsınız, bəsimdir.
Ölüm belə bacarmaz
hətta sizi öldürə!

Yoxdur elə bir qüvvə
şeiri, sözü öldürə!
Sizə yaxınlaşanda
görmüşəm ölüyə də,
diriyə də gərəyəm.
Sizdən uzaqlaşanda
görmüşəm fikircə də,
boyca da bir çərəyəm.
Gərəksizəm, zəifəm,
kədərliyəm, məğmunam,
Çox adi bir atayam,
çox adi bir "məmuram".
Siz qüvvətli olsanız,
mən əlçatmaz olaram...
Topdağıtmaz olaram,
gülləbatmaz olaram.
Mən olmasam, nə eybi,
siz yaşayın, sağ olun.
Sizə yalan danışsam,
lap üzümə ağ olun!
Yaxşılığım sizdədir,
yamanlığım sizdədir,
Doğma xalqa, torpağa
heyranlığım sizdədir...
Damarıma, canıma,
qanıma hopmusunuz.
Mən sizdən güc almışam,
siz məndən qopmusunuz...
İlhamımla qurduğum
evimsiniz siz mənim!
Şəklimsiniz siz mənim,
eynimsiniz siz mənim!

## MƏNİM MUĞAMATIM

Mənim muğamatım dilləndi yenə,
Xəyalım illəri ötdü bir anda.
Elə bil dünyanı verirlər mənə
Sən hər dil açanda, hər danışanda!..

Hər incə zəngulən, hər incə xalın,
Qoca əsrlərin səsi deyilmi?!
Danış, çox dərindir, ağlın, kamalın,
Danış, dünya görmüş qocalar kimi!

Dinsin simli kaman, dinsin simli tar,
Səndən neçə-neçə igid danışsın.
Sənin dünya qədər hekayətin var,
Səndən Zülfü desin, Seyyid danışsın!

Segahı, Zabulu kim unudar, kim,
Kim deyir qüssəsən, kim deyir qəmsən?
Sən mənim öz böyük döyüş əsgərim,
Sən mənim ən böyük mübarizəmsən!

Dağları örtəndə hələ çən, duman,
Sən yanan qəlblərin teli olmusan.
Yadlar Nizamini susduran zaman,
Sən onun danışan dili olmusan!

Bir kimsə bilməyir hələ yaşını,
Eşqin əsrləri qucaqlamışdır.
Sənin tellərinə qoyub başını
Füzuli vətənçin çox ağlamışdır.

Səndə igidlərim çox silah çəkib,
Sən söhbət açanda gecə ağlayıb.
Atamı görmüşəm necə ah çəkib,
Anamı görmüşəm necə ağlayıb!

Səndə çox arzular gül açmadımı?
Sənsən görüş çağı, ayrılıq dəmi.
Səndə uşaq kimi dil açmadımı
Əziz Üzeyirin sevinci, qəmi?!

Gah məni almısan isti qoynuna
Qardaş ellərini dolandırmısan.
Məcnunun qolunu salıb boynuna
Ərəb çöllərini dolandırmısan!

Dəvə karvanları... zınqırov səsi...
Susuz səhraları çox keçmişəm mən.
Alışıb yananda yerin nəfəsi
Sənin nəfəsindən su içmişəm mən!

Dağların bulağı, düzlərin çayı,
Qövsi-qüzehlərin rəngi səndədir.
Nəbinin, Həcərin hayı, harayı,
İgid Koroğlunun cəngi səndədir!

Mənim muğamatım, dilləndin yenə,
Xəyalım illəri ötdü bir anda.
Elə bil dünyanı verirlər mənə
Sən hər dil açanda, hər danışanda!

## NƏ QƏDƏR Kİ, SAĞAM

Nə qədər ki, ömr edirəm,
Nə qədər ki, hələ sağam,
Nə qədər ki, yaşayıram bu cahanda,
Fərq olmamış, olmayacaq heç bir zaman
İşlərimlə sözlərimin arasında,
Həyatımla şeirimin arasında,
Ürəyimlə gözlərimin arasında...
Daim mənim düzlük oldu əhdim, andım,
Mən həmişə vicdanıma arxalandım.

Vətən kimi, ana kimi,
Dost dediyim bir adama
Mən dost dedim sona kimi.
Dostu gündə paltar kimi dəyişmədim...
Ad-san üçün heç bir zaman
            vuruşmadım, döyüşmədim...
Qışqırmadım, bağırmadım,
Addımbaşı çağırmadım: mən də varam.
Fikirləşdim: haysız-küysüz
            yaşayıram...
Fikirləşdim: zaman özü
Yaxşını da, yamanı da
Bircə-bircə qeydə alır...
Xeyirxahlıq oldu ancaq idealım,
Adamlara yaxşılığı
Paylamadım minnət kimi...
Ya borc kimi, rüşvət kimi...
Özüm mənən zənginləşdim
            əl tutanda bir adama,
Zənginləşdim zaman-zaman...
Ələ imkan keçən kimi
Gəmirmədim hər nə gördüm
            siçan kimi.
Nə verdilər dəvə kimi kövşəmədim...
Yox, mən belə yaşamadım...
Dəbdə olan çox şey gördüm,
Dəbdə olan geyim gördüm,
            maşın gördüm, dərman gördüm,
            mebel gördüm, dümbəy gördüm...
Dəbdə olan dayı gördüm,
            arvad gördüm, roman gördüm.
Dəbdə olan çox şeylərə qulaq asdım,
Dəbdə olan geyimlərə fikir verdim.
Dəbdə olan söhbətlərə,
            deyimlərə fikir verdim.
Dəbdə olan müğənnilər
Yanıb, sönüb, yox oldular,

Təzələri doğuldular.
Şənliklərə gedən kimi
“Tərəkəmə”, “Xançobanı”,
“Sarı gəlin” çalın dedim,
İstəyirəm bizim qədim mahnılara
dalım dedim...
Füzulidən, Nəsimidən deyin mənə,
Öz əslimdən, öz nəslimdən deyin mənə,
Tərif gördüm
neçə-neçə mərtəbəli,
Tərifləri saman kimi
yelə verdim birdəfəlik.
Fikirləşdim: tərif ömrü
kəpənəyin ömrü qədər...
Səhər gələr, axşam gedər...
Azərbaycan!
Poeziya! Balalarım!
Onlar oldu allahlarım!
Mən onların eşqi ilə sevib ötdüm,
Bu üç sözü başım üstdən asıb qoydum!
Dediyimi onlar üçün deyib ötdüm,
Yazdığımı onlar üçün yazıb qoydum!
Çalışmadım şeirlərim
Küylü olsun, haylı olsun!
Qoymadım ki, bircə sözüm
Bu torpaqdan ayrı olsun!
Çalışdım ki, hər sözümün
Yeri olsun, yurdu olsun!
Çalışdım ki, hər sözümün
Canı olsun, odu olsun!
Nəğmə ötdüm adi, sadə,
Uzaq-uzaq dünyalarda
Şeir-sənət aramadım,
Mən bu işə yaramadım.
Nə qədər ki, ömr edirəm,
Nə qədər ki, hələ sağam,
Nə qədər ki, yaşayıram bu cahanda,

Fərq olmamış,
            olmayacaq heç bir zaman
İşlərimlə sözlərimin arasında,
Ürəyimlə gözlərimin arasında,
Dünənimlə səhərimin arasında.

## ŞAİRİ ÖLDÜRDÜLƏR

Şair kimdir, nədir axı?
Öz elinin ən ağıllı ağsaqqalı,
Ən sadəlövh bir uşağı.
Şairləri öldürməyə
            nə var, axı?!
Ümidini, inamını al əlindən,
Dəryasını, ümmanını al əlindən,
Vətənində
            azad-azad oxumağı
            al əlindən,
            ölər şair.
Böyüdüyü düzü, dağı
            al əlindən
            ölər şair.
Tapdadımı yad ayaqlar yollarını,
İtirəcək aylarını, illərini.
Təyyarəylə,
            gəmi ilə, maşınlamı
Sərvətləri
            yad ellərə daşındımı,
Dağlarında
            yad kölgələr göründümü,
Eli, xalqı parça-parça bölündümü,
Polad sədlər
            qoyuldumu cəh-cəhinə,
Yad ləhcələr
            qarışdımı ləhcəsinə,
Qara əllər

onu xalqdan ayırdımı,
Ana dili
məhəlli dil sayıldımı,
Donar şair,
yanar şair,
ölər şair,
Pələng kimi nərildəyər,
Quzu kimi mələr şair.
Şair kimdir, nədir axı?
Öz xalqının
güllə tutmaz şah zirvəsi,
Topdağıtmaz uca dağı,
Çox çətindir
Məhv eləmək şairləri,
Mümkün deyil, asıb kəsmək,
Gülləmək şairləri.
O, xalqının
daim görən gözləridir,
O, xalqının rəhbəridir,
əsgəridir.
O, xalqının daim ayıq vicdanıdır,
El ürəyi ən sonuncu ünvanıdır.
Mümkün deyil,
məhv eləmək şairləri,
Mümkün deyil, asıb kəsmək,
Gülləmək şairləri.
Parça-parça ətini kəs, diriləcək,
Gözünü oy, başını əz, diriləcək,
Nişan alıb odla onu, diriləcək,
Öldür min bir adla onu, diriləcək,
Diri-diri soy şairi, diriləcək.
Top ağzına qoy şairi,
diriləcək,
Yandır gündə,
öldür gündə, diriləcək.
O, xalqının ürəyində diriləcək,
Həqiqətə, əfsanəyə bürünəcək,

Doğma ana ləhcəsində görünəcək.
Əsrlərlə kəs səsini, diriləcək,
Azad görsə ölkəsini, diriləcək,
O, xalqının yaddaşında diriləcək,
Yüz yaşında, min yaşında diriləcək.
Mümkün deyil,
Məhv eləmək şairləri,
Mümkün deyil, asıb kəsmək,
gülləmək şairləri.
Pablo belə şair idi,
Pablo belə ölməz idi.
Silah ilə
Nerudaya qəsd eləmək əbəs idi,
Bilirdilər
o bunların fövqündədir,
Ən yırtıcı silahların fövqündədir,
Əsarətin, zülmün, şərin fövqündədir,
Ən müasir ölümlərin fövqündədir,
Bilirdilər Pablo çoxdan
Güllәbatmaz bir xilqətdir,
Bilirdilər
Onu bircə məhv eləyən silah varsa,
xəyanətdir,
Bunun üçün fitnə ilə,
hiylə ilə öldürdülər,
Neçə günə, neçə aya,
neçə ilə öldürdülər.
Asta-asta öldürdülər,
Usta-usta öldürdülər,
Qara-qara polkovniklər irişdilər,
Bir şairin vətənini dəyişdilər,
Bir millətin taleyini
dəyişdilər,
Nerudanın güllərini
yad burunlar iylədilər,
Limanında yad gəmilər əylədilər,
Saçlarına yad küləklər toxundular,

Çöllərində yad mahnılar oxundular.
Ən birinci
Nerudanın vətənini öldürdülər,
Meşəsini, çəmənini öldürdülər,
Günəşini, dumanını öldürdülər,
Sonra onu öldürdülər.
Damla-damla, gilə-gilə öldürdülər,
Əsla gözə görünməyən
tüfəng ilə öldürdülər,
güllə ilə öldürdülər,
Min mənəvi xəncər ilə,
şillə ilə öldürdülər.
Min mənəvi zəhərlərlə öldürdülər,
Nerudanı vətənində
Yad əllərlə öldürdülər.

## BİR ANA QUCAĞINDA BİR KÖRPƏ APARIRDI

(*lövhə*)

Küçələrdən keçənlər durub
boylanırdılar,
Cavan qızlar, gəlinlər gizlicə yanırdılar.
Göz qoyurdu qarılar köks ötürüb dərindən,
Seyr edirdi uşaqlar, seyr edirdi gəlinlər.
Bütün şəhər elə bil bu lövhəyə dalırdı,
Bir ana qucağında bir körpə aparırdı.

Ona ad gəzirdilər, beşik axtarırdılar,
Başına dönürdülər, qadasın alırdılar.
Nənəsi yorğanını bərk-bərk
qucaqlamışdı,
Xalası bələyinə göy muncuq bağlamışdı,
Əmisi əsgər kimi yeriyirdi dalınca,
Osa sakit, astaca baş qoymuşdu balınca...

Xırda, qara gözləri açılır, qapanırdı,
Bir ana qucağında bir körpə aparırdı...
Büsbütün arzuları
uşaq təzələmişdi,
Uşaq nə eləmişdi,
tamam düz eləmişdi,
Nə qədər istək, murad gətirmişdi özüylə,
Baba kimi fəxri ad gətirmişdi özüylə,
Nənə kimi fəxri ad gətirmişdi özüylə.
Ata istəyi üçün, ana harayı üçün,
Qaynar, gur, təlatümlü ailə çayı üçün
Bir dayaq aparırdı, bir körpü aparırdı.
Bir ana qucağında bir körpə aparırdı...
Dünya bir nəğmə idi,
dünya bir yuxu idi,
Elə bil yer üzündə
bir tifil də yox idi.
Muzeylərə dönmüşdü sanki yetimxanalar,
Dəyişmişdi elə bil nankor ata-analar,
Elə bil hər tərəfdən süd qoxusu gəlirdi,
Analar şərəfinə alqışlar yüksəlirdi,
Bütün dillər elə bil xoş bir layla
çalırdı,
Bir ana qucağında bir körpə aparırdı...

İşıqlanmışdı sanki zülmət-zülmət
ölkələr,
Nur içində üzürdü uzaq, yaxın qitələr,
Hər an artan ordular azalmışdı elə bil,
seyrəlmişdi elə bil,
Bütün hərbi bazalar yumşalmışdı elə bil,
kövrəlmişdi elə bil,
Elə bil ki, ölənlər, itənlər tapılırdı,
Bir ana qucağında bir körpə aparırdı.

Demə balaca idi, demə ki, kiçik idi,
O mənim yurdum üçün lap əsil kişi idi,

Böyük bir nəsil idi o mənim xalqım üçün,
O bir bərəkət idi süfrəmdə, ocağımda,
Mənə elə gəlirdi o ana qucağında
Bir ordu aparırdı, bir ölkə aparırdı,
Bir ana qucağında bir körpə aparırdı.

## YOLDAŞ ÖLÜM!

Yoldaş ölüm!
Hamı bilir, sən çox evlər uçurmusan,
Milyonları bu dünyadan
            vaxtlı-vaxtsız köçürmüsən.
Qəhrəmanlar aparmısan,
            bu aləmdə yoxdur tayı,
Yer altında olanların
            yer üstündə yoxdur sayı.
Sinələrdə çalın-çarpaz dağlar qoyub,
Anaları, bacıları ağlar qoyub
Sən dahilər susdurmusan –
            millətlərin iftixarı.
Susdurmusan varlıları, kasıbları...
Qoymayırsan göz açmağa adamı sən,
Uşaq idim,
            bir gün aldın əllərimdən atamı sən.
Söylə, azmı fitnələri
            dəf etdilər əlin ilə?
Mənim qaynar Müşfiqimi
            məhv etdilər əlin ilə.
Sən gəlirsən gündüz olur, gecə olur,
Bəşər cansız vücudunun
            qarşısında cücə olur...
Sən Əzrayıl nəfəslisən,
Sən cəhənnəm qoxulusan.
Sən tüfəngdən, sən bombadan,
Sən atomdan qorxulusan!

Aparsan da bu dünyadan bizi bir-bir,
Nə gizlədim, bəzən səndən xoşum gəlir.
Nə zaman ki,
bir alçaqdan,
bir xəbisdən,
gərəksizdən,
diləksizdən,
ürəksizdən
bac alırsan,
Bax, o zaman gözlərimdə ucalırsan.
Vicdanını var-dövlətə satanları,
Vəzifədən milyon əllə tutanları
Nə zaman ki, stolundan qoparırsan,
Vəzifəsiz, şan-şöhrətsiz
bir aləmə aparırsan,–
Həyatını çatdırırsan başa, ölüm,
Bax, mən onda söyləyirəm:
Yaşa, ölüm!
Qabağında qaya nədir,
polad nədir,
dəmir nədir,
dövlət nədir,
ordu nədir,
əmr nədir?
Əlindədir
topdağıtmaz sarayların açarları,
Sən məhv etdin,
Çingizləri, Batıları, Qacarları.
Adolf Hitler! –
O alçağın üzərinə atılanda,
Sinəsində quzğun kimi oturanda,
Görünsəydin gözə əgər,
yüyürərdim qabağına,
Yıxılardım ayağına...
Bu aləmə carsan, ölüm!
Hamı üçün varsan, ölüm!

Nə zaman ki, hiss elədin
insanlara gərəksizəm,
İlhamsızam, duyğusuzam, ürəksizəm,
Bu həyatdan tap, al məni!
Min yol xahiş eləyirəm, apar məni!

## DAHA DƏHŞƏT

Yurddaşlarım öz yurdunda əsir, yesir,
Anaların, bacıların ahı dəhşət...
Bu torpağı yada vermək dəhşətdisə,
Bu dəhşətlə razılaşmaq daha dəhşət...

Şuşasızlıq ağrısına hamı dözür,
İtirilmiş mahalların sayı – dəhşət...
Minlər ilə şəhid görmək dəhşətdisə,
Şəhidliyə vərdiş etmək daha dəhşət...

Ölənlərə ağlamayır daha kimsə,
Allah, saymır çoxu qonşu vayın – dəhşət...
Çöl düşmənim qorxuncdusa, dəhşətdisə,
İç düşmənim daha qorxunc, daha dəhşət...

Nə ki, Laçın, Ağdamda da yadlar gəzir,
Kəlbəcər də oldu düşmən payı – dəhşət...
Cəbrayılı satmaq əsil dəhşətdisə,
Xocalının soyqırımı daha dəhşət...

Geri torpaq almayacaq heç kim bizə,
Biz də olduq Fələstinin tayı – dəhşət...
Özümüzə güvənməmək dəhşətdisə,
Özgələrə arxalanmaq daha dəhşət...

Ona, buna dil tökürük durub bəzən,
Dünya bizi zəif, gücsüz sayır – dəhşət...
Vəhşi olmaq, cəllad olmaq dəhşətdisə,
Naçar olmaq, miskin olmaq daha dəhşət.

Yastıq verin, yorğan çəkin üstümüzə,
Yuxudayıq ilin on bir ayı dəhşət.
Qəflətlərdə olmağımız dəhşətdisə,
Durmağımız daha müşkül, daha dəhşət...

Azərbaycan yarı yadda, yarı bizdə,
Eşidən yox bu harayı, hayı – dəhşət...
Bu günümüz ağıdırsa, dəhşətdisə,
Sabahımız kaş olmaya daha dəhşət...

## ÖZÜNÜ QORU, XALQIM...

Müqəddəs, ulu xalqım,
Gözümün nuru, xalqım...
Ən dəhşətli zamandır,
Özünü qoru xalqım...
Bir tora ilişmisən,
Caynaqları dərində...
Bir oyuna düşmüsən,
Oyuncaqlar əlində...
Üzərində əsirlər,
Qara yellər görürəm.
Sənə quyu qazırlar,
Mənfur əllər görürəm...
Təklənmisən yenə də,
Yenilməz, ulu xalqım...
Oğul sözüm sənədir,
Özünü qoru, xalqım...
Kimin bəd əməli var,
Tarix özü söyləsin.
Burda iblis əli var,
Burda şeytan hiyləsi...
Əzir torpaqlarını,
Yenə dəmir çəkmələr.
Müstəmləkə qanunu,
Böl, parçala, hökm elə.

Bölürlər bilə-bilə,
Dağ çəkirlər sinənə...
Beləcə, bölə-bölə,
İstəyirlər bu yurdu,
Yer üzündən silələr...
Yalvarıram, amandır,
Allah sözü dilimdə,
Sən belə dar məqamda,
İçəridən bölünmə,
İçəridən talanma...
Bizim, sizin elliyə,
Əqrəbaya yerliyə,
Amandır parçalanma...
Ayırmayaq bu xalqı,
Doğma, ögey kəslərə...
Ən betəri odur ki,
Xalq özünə qəsd edə...
Özünün əli ilə,
Öz-özünü öldürə...
Yetər, bizim bu yurdu,
Obalara böldülər,
Mahallara böldülər,
Ostanlara böldülər,
Küçələrə böldülər,
Dalanlara böldülər...
Bu düşmənəköməkdir,
Bu düşmənə mükafat...
Bizə birlik gərəkdir,
Ay el, oba, camaat...
Qüdrətimsən, gücümsən,
Çağlayırsan qanımda...
Amma sayca kiçiksən,
Böyüklərin yanında...
İllərlə səni, xalqım,
Söküb talan ediblər,
Balaca səsin qalxıb,
Güllləbaran ediblər...

Min cür fəndlər gəziblər,
Yüz cür qanun yazıblar...
O sahildə asıblar,
Bu sahildə kəsiblər,
Amma ki, iradəni,
Sındıra bilməyiblər.
Heç ölümlə də səni,
Öldürə bilməyiblər...
Yenə göylər dumandır,
Qəhrəman, ulu xalqım...
Ən dəhşətli zamandır,
Özünü qoru xalqım...

## VƏZİFƏ BU XALQA QƏNİM KƏSİLİB...

Bu millət vəzifə dəlisi imiş,
Şan-şöhrət "ölüsü", "rütbə" düşkünü.
Vəzifə çoxunun mərəzi imiş,
Həmi "qara" günü, həmi "xoş" günü...

Çoxunun "ilk eşqi", "ilk məhəbbəti",
"İlk əhdi", "ilqarı" imişsən, demə.
Həmi "səadəti", həmi "möhnəti",
Həyat idealı imişsən, demə.

Müdir stolundan tutur ölüncə,
Ayrı şey gözündə puçmuş, yalanmış.
Nə vətən, nə torpaq bu millət öncə,
Vəzifə uğrunda həlak olarmış...

Hamı uşaqlıqdan keçir bu dərsi,
Tək ona bağlayır arzularını.
Sən ona rütbə ver, o sənə versin,
Hətta qeyrətini, namus, arını...

Nə vicdan, nə məslək, nə zəka, əməl
Tək ona qul olur, rəğbət bəsləyir.
Sən ona rütbə ver, satsın əlbəəl,
Bütün uluları, müqəddəsləri...

Hamı candan keçir vəzifə tutsun,
Rütbə stolları yamaq-yamaqdır...
O kütlə gözündə Allahdan üstün,
İnamdan qabaqdır, dindən qabaqdır...

Cavan da, qoca da sevir tacı-taxt,
Gəda da istəyir şah ola hətta...
Dava da qurtarar, qurtarmaz heç vaxt,
Vəzifə davası bu məmləkətdə...

Dostunu vəzifə başında tanı,
O açır hamının əsil üzünü...
Bu yolda çox qırıb insan-insanı,
Qanlar axıdılır, başlar kəsilir...

Hamının qarnının ağrısı birdir,
Vəzifə bu xalqa qənim kəsilib...
Onunçün yerinə yetirə bilmir,
Bu millət millətlik vəzifəsini...

## KAŞ MİLLƏTDƏ RUH YAŞASIN...

Millət əzər, əzilər də,
Kaş millətdə ruh yaşasın.
Əyri qəddi düzələr də,
Kaş millətdə ruh yaşasın...

Zaman-zaman, nəsil-nəsil,
Babəklərin gəlir səsi.
Nəsimilər tükənməsin,
Kaş millətdə ruh yaşasın...

Sabirlərə xəbər olsun,
Qız-gəlinlər Həcər olsun.
Kişilərdə təpər olsun,
Kaş millətdə ruh yaşasın...

Qeyrət ruhun gücündədir,
Qüdrət ruhun gücündədir.
Millət ruhun gücündədir,
Kaş millətdə ruh yaşasın...

Düşməni qul etmək olar,
Min əsr yol getmək olar.
Dünyanı titrətmək olar,
Kaş millətdə ruh yaşasın...

## ATAMDIR ƏQİDƏM – ATAMIN OĞLUYAM...

Heç zaman ağlıma gəlməzdi, heç zaman,
Əqidə dəyişmək bu qədər asanmış...
Bir anda özünü danırmış insan,
Özünün əliylə özünü asarmış...

Çökərmiş üstünə fəlakət buludu,
Enərmiş zirvədən dərəyə, təpəyə,
Vücudu qalarmış, qup-quru vücudu,
O da ki, dəyməzmiş bir qara qəpiyə...

Yalanmış bu qədər vuruşmaq, döyüşmək,
Bu qədər and-aman eyləmək yalanmış...
Nə qədər asanmış əqidə dəyişmək,
Lap corab dəyişmək qədər asanmış...

Varmıdır de, bundan dəhşətli cinayət,
Ən qatı qatildir, əqidə qatili...
Əxlaqa xəyanət, inama xəyanət,
Ən böyük satqınlıq, ən böyük cahillik...

Nədir ki, bu xalqın görəsən günahı,
Ki, içi bu qədər manqurtla dolubdur,
Bu necə dövrdür, özün de, ilahi,
Ki, əqidəsizlik əqidə olubdur...

Milləti üzübdür çəkişmək, didişmək,
Bu da qanımızda lap köhnə azarmış...
Nə qədər asanmış əqidə dəyişmək,
Bir qurtum su içmək qədər asanmış...

Hirsimdən sıxıram dişimi dişimə,
Axı, hey yazıblar dünyayi-qədimdən,
Amalı yolunda can verib kişilər,
Amalı yolunda ölümə gediblər...

Əqidə idarə eyləyir cahanı...
O nəhəng ağaclar soy-kökü dəyişməz...
Babalar deyiblər: həqiqi insanın,
Dünyası dəyişər, məsləki dəyişməz...

Nə qədər çox imiş kölgədə yatanlar,
Əyilməz vicdanlar nə qədər az imiş...
Nə qədər çox imiş məsləksiz nadanlar,
Məsləki olanlar nə qədər az imiş...

Əqidə doğrusa, zaval yox, doğruya,
Mayası poladdır, o sınar, əyilməz...
Atamdır əqidəm – atamın oğluyam,
Dəyişməz əqidəm, heç zaman dəyişməz...

## CABİR, BU DA AZDI SƏNƏ...

Niyə doğdu səni anan
Cabir, bu da azdı sənə...
Nə zövq aldın bu dünyadan?
Cabir, bu da azdı sənə...

Yaşamısan göz açandan,
Hər cürə bəd, pis içində,
Qovrulursan öz içində,
Cabir, bu da azdı sənə...

Ərzə qədəm qoyan yerdə,
Bataydı gündağın şərdə.
Hər şey gördün bu əsrdə
Cabir, bu da azdı sənə...

Nə biclik, nə yalan bildin,
Nə pislik, nə haram bildin.
Sən hamını adam bildin,
Cabir, bu da azdı sənə...

Çox güvəncin sovğa çıxdı,
Cavanlığın dağa çıxdı.
Qara saçın ağa çıxdı,
Cabir, bu da azdı sənə...

Yaxşı oldun yamana da,
Qane oldun yavana da.
Qaç bu zalım zamanadan,
Cabir, bu da azdı sənə...

Ömrün oldu ələk, vələk,
Yollarına yağdı çiçək.
Qamətini əyir fələk,
Cabir, bu da azdı sənə...
Hamı sındı sən sınmadın,
Durdun, dözdün, sarsılmadın.
Heç nə sənə dərs olmadı,
Cabir, bu da azdı sənə...

Əzablarla yüklənmisən,
Sarı simdə köklənmisən.
Yurdun kimi təklənmisən,
Cabir, bu da azdı sənə...
Şair, bu da azdı sənə...

## BİR ANAM, BİR DƏ NƏVƏM TƏBRİZƏ...

Qopur ürəyimdən sonuncu nida,
Sonuncu hıçqırıq, sonuncu nəfəs...
Əlvida, yalançı dünya, əlvida,
Ta sənlə bir yerdə qalmağa dəyməz...

Daha qurtuluram əlindən sənin,
Düşürəm xatirə kitablarına...
Əlvida deyirəm, dünya, mən sənin,
Bütün dərdlərinə, əzablarına...

Kaş ki, daş olaydım xilqət olunca,
Dünyanın əşrəfi insan yalandır...
Budur, əzrayıl da əli qılınclı,
Başımın üstünü kəsdi, dayandı...

Əlvida, əlvida yalançı dünya,
Çökür gözlərimə zülmət, qaranlıq...
Əlvida, əlvida yalançı dünya,
Həqiqi dünyama yetirəm artıq...

Nə vaxt ki, həyata zühur eylədim,
Anamın bətnindən qoynuna düşdüm...
Nəhəng bir zindana girdim elə bil,
Sehrə, tilsimə, oyuna düşdüm...

Mən səndə nə gördüm, saysız dərd, kədər...
Mən səndə nə gördüm, ölüm, qan-qada,
Mən səndə nə gördüm, diri ölülər,
Əlvida, oyuncaq dünya, əlvida...

Səndən nə əxz etdim, təkcə məhəbbət,
Onunla çox ağır illər yaşadım...
Hər şeyə əlvida desəm də fəqət,
Mən vida demirəm sənə, ey qadın...

Bir də üç oğluma köküm, məhvərim,
Əlvida deмərəm, deyə bilmərəm.
Qoyun boylarına baxım son kərə,
Onları görməsəm, ölə bilmərəm...

Əlvida, ikili xalqım, millətim,
Əlvida, ikili vətən, əlvida.
Səni bircə gün də bütöv görmədim,
Nigaran gedirəm səndən, əlvida...

Hanı, o əvvəlki torpağım, hanı,
Düşdük ləyaqətdən, düşdük şərəfdən...
Yenə də bölürük Azərbaycanı,
Düşmən bir tərəfdən, biz bir tərəfdən...

Bir təbiətdən gedirik razı,
Bir də ki, günahsız heyvanlarından...
İstərəm son kərə bağrıma basım,
Bütün yaxşı, yaman insanlarını...

Bir də ki, ölmədim Təbrizi gördüm,
Gördüm o taydakı qardaşlarımı...
Ulu Şəhriyar tək əzizi gördüm,
Tökdüm məzarına göz yaşlarımı...
Bax bu möhnət üçün sağ ol, a dünya,
Səndən ricam budur, diləyim budur...

Xalqım birləşməsə dağıl, a dünya,
Səndən ən sonuncu istəyim budur...

Bircə nəvə gördüm, Təbrizdir adı,
Bərk-bərk tapşırıram sənə mən onu...
Nə ölüm, nə itim heç nə dünyada,
Heç nə silə bilməz könlümdən onu...

Əlvida, yer, səma, əziz dost, həmdəm,
Əlvida hər şeyə, bir də hər kəsə...
Ölsəm də əlvida deyə bilmərəm,
Bir anam, bir də ki, nəvəm Təbrizə...

## ADIM GƏLDİ BU DÜNYAYA

Yığırdım ömür köçümü,
Adım gəldi bu dünyaya.
Eynən elə özüm kimi,
Adam gəldi bu dünyaya.

Dua etdim körpə balam,
İsmim olsun sənə halal,
Özüm diri ola-ola
Müdam gəldi bu dünyaya...

Ta əzrayıl sən şarlatan,
Qapımızdan itil, usan,
Soyum, köküm, əmim, babam,
Atam gəldi bu dünyaya.

Əcələ qışqırdım: bil ha,
Gücün çatmaz mənə daha,
Korsan, bax, nə ər, əjdaha,
Titan gəldi bu dünyaya...
Bu gəlişdə mənа dərin,
Əbədiyyət oldu yerim,
Kəfənini ölümlərin,
Yırtan gəldi bu dünyaya...

Təzə Cabir, eşit məni,
Adaşına ver əlini,
Köhnə Cabirin yerini,
Tutan gəldi bu dünyaya...

## ŞEİR ƏKDİM BU QALANIN İÇİNDƏ

Bu həyata göz açalı əzildim,
Ağır-ağır qayğıların
içində...
Öz nəğməmin havasına kəsildim

Quzğunların, qarğaların
içində...
Mənliyimi uca tutdum, saxladım,
Sürü-sürü mal-qaranın
içində...
Ucuz şöhrət arxasınca qaçmadım,
Dəllalların, darğaların
içində...
Qara sezdim hətta ağa baxanda,
Ağ da gördüm qaraların içində...
Hayla-küylə istəmədim xalqımı,
Qeyrət gəzmə qalmaqalın
içində...
Gedişini, gəlişini dünyanın
Ölçdüm, biçdim, xırdaladım
içimdə...
Böyüklərdə bir böyüklük görmədim,
Böyük tapdım xırdaların
içində...
Talan oldu yurdum, yuvam, torpağım,
Talan oldum bu talanın
içində...
Yaralandı, paralandı millətim,
Hey qovruldum bu yaranın
içində...
Həqiqəti, ədaləti boğdular,
Min əyrinin, min yalanın
içində...
Bir eybsiz, təmiz xilqət tapmadım,
Nə gedənin, nə qalanın
içində...
Sehr dolu bir qalaya sığındım,
Şeir əkdim bu qalanın
içində...

## NEÇƏ TƏZƏ ŞAİR GƏLƏR BU DÜNYAYA...

Sal qayayam, yoğrulmuşam qüdrət ilə,
Heç bir rüzgar bu səfimi yara bilməz.
Lap əzrayıl canımı da ala bilər,
Amma məndən qələmimi ala bilməz.

Söz rişəmin soyu, kökü dərindədir,
Həm ləşkəri, həm kişvəri yerindədir.
Qüvvəm, gücüm ilhamımın əlindədir,
Kimsə məni söz taxtımdan sala bilməz.

Aşıq üçün təbib başqa, dərman başqa,
Qanun başqa, qayda başqa, fərman başqa.
Bir şeirdən, bir də nazlı yardan başqa,
Heç Allah da dərdlərimə çarə bilməz.

Bir gün ölüm didər məni, dələr məni,
Son məqamım, son saatım gələr mənim.
Gözlərimə qara zülmət dolar mənim,
Sözlərimə qara zülmət dola bilməz.

Təzə kəslər düşər eşqə, təmənnaya,
Təzə sözlər köhnələri salar saya.
Neçə təzə şair gələr bu dünyaya,
Amma biri Cabir Novruz ola bilməz.

## YALTAQDAN ŞAİR OLMAZ

Yaltaqdan “şair” olar,
şairdən yaltaq olmaz,
Şairin qürurunu
heç nəylə almaq olmaz...
Oyuncaqdır əllərdə
yenə bəzi yazarlar,

Əsil şair heç zaman
əldə oyuncaq olmaz...
Məddahlardır yenə də
əl-ayağa dolaşan.
Onları nə ki, yazar
heç insan saymaq olmaz...
Kişilikdir şairin
ömrü, yolu, amalı,
Qorxaqların sözünə,
şeirinə uymaq olmaz...
Ürəyi sapdan incə,
iradəsi poladdan.
Şair tək müdrik insan,
şair tək uşaq olmaz...
Bütün şahlar, xaqanlar
baş əyiblər şairə.
Şair əyildi, ondan
xalqına dayaq olmaz...
Şahsız da keçinərik,
bəysiz də dolanarıq,
Füzulisiz, Sabirsiz
fəqət yaşamaq olmaz.

Şairi yalnız millət
mühakimə eləyər,
Ayrı yerdə
məhkəməsi baxılmaz...

## AZƏRBAYCANI SEVİN, SEVİN AZƏRBAYCANI...

Azərbaycanı sevin, sevin Azərbaycanı,
Bu gün odlu sevgiyə onun ehtiyacı var...
Sevin odum, ocağım, evim Azərbaycanı,
İndiki dərdlərinə eşqimiz əlac olar...
Yaraları göynəyir, yaraları sızlayır,

Bu millətin qeyrətli oğulları, qızları,
Sevgimiz xilas edər bu gün Azərbaycanı,
Azərbaycanı sevin, sevin Azərbaycanı...
Adını uca tutun hər arzudan, diləkdən,
Doymayın, usanmayın ona ana deməkdən...

O bizim hamımızın həyəcanı, harayı,
Bir də axı kim yanar ona bizdən savayı?..
O bizim ruhumuzda, o bizim qanımızda,
Yalnız biz keçməliyik uğrunda canımızdan.
Can istəsə can verin, sevin Azərbaycanı,
Qan istəsə qan verin, sevin Azərbaycanı...

Azərbaycanı sevin, sevin Azərbaycanı,
Kürül-kürül odlanan evim Azərbaycanı...
Dünyada vallah, belə talesiz millət olmaz,
Nə qədər saxlayarlar girov Azərbaycanı?..
Bu qədər bölgü olmaz, bu qədər sərhəd olmaz,
Bəs nə vaxt görəcəyik bütöv Azərbaycanı?!

Ona övlad payını bizlər verə bilmədik,
Heç iki obasını birləşdirə bilmədik.
Astara qovuşmadı doğma Astarasına,
Cülfalıların bir məlhəm tapmadıq yarasına,
Öz doğma yurd-yuvamdır yadın Azərbaycanı...
Biz bacara bilmədik, ey gələcək nəsillər,
Ey gələcək nəsillər, barı təzə əsrdə,
Bir-birinə calayın, qatın, Azərbaycanı,
Köküm, soyum, soyadım, adım Azərbaycanı...
Haçandır öz-özündən aralı bir ölkədir,
Şəhidli bir ölkədir, yaralı bir ölkədir...

Az imiş, o təzədən bölünür, parçalanır,
Təbriz dərdi üstünə Şuşa dərdi qalanır.
Neçə yerə ayrılar, ya İlahi, bir bədən?
Xırda bir məkan qalıb o boyda bir ölkədən...

Tamam bitər, tükənər belə getsə amandır,
Axı o bir zamanlar nəhəng Azərbaycandı;
Zaman-zaman talayıb, biçib Azərbaycanı,
Bizə miras qoydular kiçik Azərbaycanı.

Ay bizdən ola-ola bizə yağı olanlar,
Vətənə sevgidə də az marağı olanlar;
Xalqına xidmətdə də tamah gəzən dənilər;
Özümüzdən olanlar, özümüzə qənimlər;
Siz də qeyrətə gəlin, imana-dinə gəlin,
Vətən bağışlar sizi, vətən eşqinə gəlin,
O, sizə çörək verib, nəzir-niyaz eyləyib,
Yalnız onun sevgisi sizi xilas eyləyər.
Sevməyirsizsə barı boğazına çökməyin.
Bu ulu məhəbbətə çağırıram hər kəsi,
Divin canı şüşədə, onun bizdədir canı...
Məndən çox sevirsiniz bu torpağı bəlkə siz,
Amma təkrar deyirəm; sevin Azərbaycanı,
sevin Azərbaycanı...

## BİR YAŞIN

Mənim Rəsul nəvəm təzə soy, köküm,
Təzədən doğulan böyük qardaşım...
Sənin ad günündür, əzizim, bu gün,
Ərzin milyon yaşı, sənin bir yaşın...
Hələ ağlın kəsmir, hələ uşaqsan,
Hələ çox şeylərdən xəbərin yoxdur.
Sonralar həyatı anlayacaqsan,
Ki, onun səfadan cəfası çoxdur...
Ki, onun sevincdən kədəri boldur,
Yamanı saysızdır, yaxşısı tək-tük...
Sökür bu dünyanı bir ovuc quldur,
Çapır bu dünyanı bir ovuc dönük...
Hələ bir istəyin dəyməyib daşa,

Hələ bir alçaqla üzləşməmisən...
Hələ bir ümidin çıxmayıb boşa,
Bir haqla, nahaqla üzləşməmisən...
Hələ arzuları çəpərsiz, balam,
Tamam dərdsiz balam, kədərsiz balam...
Dünyada heç xoşbəxt varmı, de səndən,
Ata, ana kimi bir dayağın var...
Bircə acıyanda, bircə suzanda,
Yuxun dağılanda ağlamağın var...
Aləmdir üzünün, gözünün sehri,
Hələ beşiyini dünya sayırsan
Bacından, babandan, nənəndən qeyri,
Hələ bir kimsəni tanımayırsan...
Yaxşı ki, yaxşı ki, ay sənə qurban,
Hələ adamları tanımayırsan...
Hələ ürəyinə dəyən olmayıb,
Hələ ki, işlərin gedir yağ kimi,
Sənə bir acı söz deyən olmayıb,
Təmizdir ürəyin ağ varaq kimi...
Gəlsin ziyarətə ulular gəlsin,
Lap göydən müqəddəs mələklər ensin...
Bu murdar dünyanın, məkrli ərzin,
Hələ ki, ən təmiz varlığı sənsən...
Yolunda bir fitnə, fəsad, qurğu yox,
Canında bir gilə ürkü, qorxu yox...
Hələ nə yaşın var, hələ uşaqsan,
Bunları sən sonra anlayacaqsan,
Dünən məmləkətdə qopdu zəlzələ,
Bakı az qaldı ki, uçula, oğlum...
Millət az qaldı ki, qırıla, ölə,
Sən əsla almadın vecinə, oğlum...
Başlandı qaçhaqaç, haray, köçhaköç,
Böyüklər, kiçiklər düşdü nə günə,
Sənin bircə tükün tərpənmədi heç,
Baban qibtə etdi kişiliyinə...
Siz mənə göstərin elə ər insan,
Bu oğul nəvəmlə dayana bahəm...

Bütün qorxaqlara meydan oxuyan,
Bir yaşlı mərd balam, qəhrəman balam...
Allahım qorusun nəzərdən, səni,
Sənə tuş gəlməsin bir nacins, xəbis...
Qüdrətim çatsaydı bəşərdən səni,
Ayırıb saxlardım belə tər-təmiz...
Qoymazdım hər düşük, nanəcib, quldur,
Bu bakirəliyə toxuna, Rəsul...
İnsanlar anadan təmiz doğulur,
Həyatdı korlayan çoxunu, Rəsul...
Tikərdim poladdan bir qala sənə,
Uzaqda tikərdim insan gözündən...
Özüm öz əlimlə ay bala, səni,
Gündə keçirərdim qıl körpüsündən...
Sənə bir şeytanı qoymazdım yaxın,
Sənə bir iblisi qoymazdım yaxın,
Bütün yamanlara əsil göz dağı,
Bütün xəbislərə əsil göz dağı,
Bütün təmizlərə nümunə kimi...
Saflara, düzlərə nümunə kimi...

## MƏNİ TAPARSINIZ ŞEİRLƏRİMDƏ...

Ruhum, təbiətim şeirlərimdə,
Əsil-nəcabətim şeirlərimdə.
Bütün soyum, köküm, qohum, əqrəbam.
Mənim Oğuz babam, Novruzbəy babam.
Mirzəbəy atamın itmiş məzarı.
Möhbanu nənəmin ağlı, kamalı,
Anamın üzünə düşən qırışlar,
Bacımın qəbrinə yağan yağışlar,
Həyatdan çox nakam gedən yoldaşım,
Üç oğlum, üç arxam, üç məsləkdaşım,
Körpə nəvələrim şeirlərimdə,
Ömrüm səpələnib şeirlərimdə.

Qəlbimin aynası – bütün sözlərim,
Bütün yaxşılarım, bütün hislərim.
Daddığım acılar, ağrı-əzablar,
Həyata verdiyim sual-cavablar,
Fərəhli günlərim, ağır günlərim,
Ömrümə, bəxtimə yağı günlərim.
İlk məhəbbətimin qönçə çağları,
Bütün ölülərim, bütün sağlarım,
Hamısı yaşayır şeirlərimdə,
Həyatım başlayıb şeirlərimdən.
Şair ədalarım, şair xislətim,
Beş litr qanımın hər bir qətrəsi.
Dizimin taqəti, qolumun gücü,
Bütün vücudumun zahiri, içi.
Fövtə götürməyən xasiyyətlərim,
Bütün təmaslarım, ünsiyyətlərim.
Sözlə qazandığım dövlətim, varım,
Qeyrətim, vicdanım, namusum, arım.
Şeirlə tikdiyim şah saraylarım,
Allahdan, bəndədən olan paylarım.
Mənim doğma əziz şeirlərimdə,
Ləkə görməzsiniz şeirlərimdə...
Para-para olmuş ana torpağım,
Neçə yol dəyişən himnim, bayrağım.
Neçə yol dəyişən əlifbalarım,
Əlifba dəyişən manqurt şahlarım.
Bu tayın nə qədər vətən xaini,
O tayın milyonla miskin sakini.
Bütün olacaqlar, bütün olanlar,
Azərbaycanıma olan talanlar.
Nə qədər fitnəkar, qurğu, fənd oyun,
Əldən-ələ keçən Təbrizim, Xoyum,
Tutqun Savalanım, Səhəndim mənim.
Mənim bəndə düşən Dərbəndim mənim.
Yenilməz Şuşamın açıq hərracı
Füzuli, Cəbrayıl, Kəlbəcər, Laçın.
Neçə igid babam, ölməz sələfim,

Şəhid qəbirləri anım, şərəfim.
Vətən, torpaq satan neçə şarlatan,
İlan-çayanla qol-boyun yatan,
Bir milyondan artıq yurdsuz qaçqınım,
Ev, ocaq dəlisi, torpaq Məcnunu,
Hamısı boylanır şeirlərimdən,
Haylarım, haraylarım şeirlərimdə.

Məni kim tanıyar, məndən savayı?!
Bircə öləcəyim gündən savayı.
Qalan hər hikmətim şeirlərimdə,
Avtoportretim şeirlərimdə.

Əbədi yaşaram mən bu cahanda.
Xeyir taparsınız şeirlərimdən
Bir vaxt bu dünyada mən olmayanda,
Məni taparsınız şeirlərimdə.

## DÜZ YAŞADIN, CABİR NOVRUZ

Düz yaşadın Cabir Novruz,
bu da düzlüyün axırı,
Düz yaşamaq yaşamağın
ən çətini, ən ağırı...
Düz yaşadın Cabir Novruz,
elə düzdə qaldın tək,
Düzlərin "qazancı" budur
düz, bu düzlüyə neyləmək...
Düz yaşadın Cabir Novruz,
bu qədər əyri içində,
Şeirin qeyrət südü əmdi
daim düzlüyün gücündən...
Süfrəndə nə olmasa da,
halal duz-çörəyin oldu...
Bir halal ilhamın oldu,

bir təmiz ürəyin oldu,
Bununçün də sən hamıdan
məğrur oldun, zəngin oldun,
Başının üstündə daim
ədalət çələngi durdu.
Paklıq, müqəddəslik oldu
sənin yol yoldaşın daim,
Düz yaşadın Cabir Novruz,
həyatda günahın,
Budur şərəfli təqsirin,
budur yeganə günahın,
Təki belə günah ola
hər bir insanın günahı...
Düz yaşadın Cabir Novruz,
məhrumiyyətlərə dözdün,
Övladlarının yanında
bir az başaşağı gəzdin...
Onlardan, düzlükdən qeyri,
əyri sərvət qoyammadın,
Düz yaşadın Cabir Novruz,
xalq uca tutur bu adı.
Düz yaşadı nakam Müşfiq,
gördüz nə oldu axırı.
Düzlük soydu Nəsimini,
düzlük çərlətdi Sabiri...
Düz yaşadın Cabir Novruz,
bu da düzlüyün axırı,
Düz yaşamaq don-kixotluq,
peyğəmbərlik, ilahilik...

## İNSANI TANIMAQ OLMUR

Fələyi tanımaq olur,
İnsanı tanımaq olmur.
Hər şeyi tanımaq olur,
İnsanı tanımaq olmur...

Ha axtar, dolan aləmi,
Bərabəri, tayı yoxdur.
Sərsəm yoxdur onun kimi,
Onun kimi dahi yoxdur...

Şeytanı tanımaq olur,
İnsanı tanımaq olmur,
İlanı tanımaq olur,
İnsanı tanımaq olmur...

O cür qəlblərə aşiyan,
Gözəllik, yaraşıq yoxdur.
O boyda zülmət daşıyan,
O boyda gur işıq yoxdur...

İlanın bir şakəri var,
Quyruğun basdın çalacaq.
İnsanın çox şakəri var,
Azını bilirik ancaq...
Elə ustalıqla çalır,
Əvvəl ağrı, acı olmur...
Adam elə günə qalır,
Sonradan əlacı qalmır...
Gah şəkər olur dilində,
Gah zəhər olur dilində...
Bilmirsən nə var içində,
Bilmirsən nə var çölündə,
Saysız yaranıb canlılar,
İnsandan qəlizi yoxdur,
Baxırsan ki, sifəti var,
Sifətindən üzü yoxdur.
Xilqət görməyir beləsin,
İnsanı tanımaq olmur.
Göydə gözə görünməzi,
Allahı tanımaq olur.
İnsanı tanımaq olmur...
Sən can qoyursan yolunda,

O sənə yamanlıq edir...
Gah gəda olur, gah sultan,
Gah da fironluq edir...
Zaman-zaman dost dediyin,
Tonlarla çörək yediyin,
Elə dəyişir ki, birdən,
Ayağın üzülür yerdən...
Dönür düşmənə, yağıya,
Qazır sənin ayağını...
Görürsən yadla əlbirdir,
Ha tanı, tanımaq olmur...
İnsan müəmmadır, sirrdir,
İnsanı tanımaq olmur,
Ən uzaq dünya insandır,
Ümman da insandan dayaz...
Ən dərin dərə insandır,
O dərinə girmək olmaz...
Yazmağa əlim gəlməyir,
Deməyə dilim gəlməyir,
Nə gizlədək olur bəzən,
Səni dünyaya gətirən,
Əkən, böyüdən, yetirən,
Atanı tanımaq olmur,
Ananı tanımaq olmur...
İnsan sirrdir, müəmmadır,
İnsanı tanımaq olmur...
Xisləti çürük olanı,
Saflığa öyrətmək çətin...
Kəşf etdik uzaq fəzanı,
İnsanı kəşf etmək çətin...
Ayın əllərini sıxdıq,
Marsa, Veneraya çıxdıq
Bir adi insanın fəqət,
Qəlbinə çıxmaq müsibət...

Göz dikdim göylərə sarı,
Ap aydın asiman gördüm.

Səf bağlamış durnaları,
Vətənə qayıdan gördüm...
Cəh-cəh vurdular necə,
Doğma “ana”, “vətən” deyib...
İnsan yurdun satır, sərçə
Bir tikanə “vətən” deyir...
Quşların dilini qandım,
İnsanı tanımaq olmur...
Dərk etdim ulu Quranı,
İnsanı tanımaq olmur...
Bağlı qapıları açdım,
Qədim kitabları açdım,
Çox-çox kəlamı oxudum,
Qorqud babamı oxudum...
Ha getdim, yüyürdüm, uçdum,
Özümdən qaça bilmədim.
Dünyanın sirlərini açdım,
İnsanı aça bilmədim...
İnsan bir sirli dünyadır,
Ha tanı tanımaq olmur...
Başdan-başa müəmmadır,
İnsanı tanımaq olmur...
İnsanı tanımaq olmur...

## ALTMIŞ İLLİYİMƏ

Kaş bu yaşa girməyəydim,
Öz xalqımı belə naçar,
belə miskin
görməyəydim...
Çəkməyəydim bu çəkilməz
əzabları,
ağrıları...
Görməyəydim yüzlər ilə
həlak olan
oğulları...

Belə müdhiş aylar, günlər
görməyəydim,
Öz yurdunda didərginlər
görməyəydim...
Yerim, yurdum gor olaydı,
Görməyəydim, kaş gözlərim
kor olaydı...
Kaş bu yaşa girməyəydim,
Qanlı yanvar dəhşətini
görməyəydim...
Bu nə qada, bu nə qandı
görməyəydim.
Şuşam necə yağılara bağışlandı
görməyəydim.
O qalasız yaşamağa
haqqım yoxdur...
O qalasız özüm heçəm,
xalqım yoxdur...
O qalasız haqqım yoxdur
nə ölməyə, nə qalmağa...
Görməyəydim Laçın necə
süqut etdi
gözlərimiz
baxa-baxa...
Bakı, Təbriz baxa-baxa...
Göylər, yerlər baxa-baxa...
Allah aman,
Həm bu taydan, həm o taydan,
Koroğlular, Cavanşirlər baxa-baxa...

II

Kaş bu yaşa girməyəydim,
Xocalının ölümünü
görməyəydim...
Kəlbəcərin bu gününü
görməyəydim.

Allah aman, Allah aman,
Görməyəydim heç bir zaman,
Ağdam kimi məmləkətim
    necə çıxdı
    əlimizdən,
Ağdam getdi, millət olmaz
    daha bizdən.
Ağdam getdi, qeyrət umma
    daha bizdən,
Ağdam getdi sinəmizdən
    bir saplanmış
    xəncər qaldı,
Ağdam getdi, ta nə qaldı,
    Bakı qaldı,
    Gəncə qaldı...
Ağdam getdi, ta nə qaldı,
    Təbriz qaldı,
    Zəncan qaldı...
Allah aman, Allah aman,
Əsr-əsr, zaman-zaman,
    neçə yerə parçalanmış
    vətən qaldı...
Ağdam getdi, ta nə qaldı,
    bir mən qaldım,
    bir sən qaldın...

III

Kaş bu yaşa girməyəydim,
Gəncədəki soyqırımı
    görməyəydim.
Özüm əsir olmayaydım
    öz əlimdə...
Allah aman, Allah aman,
Bilməyəydim heç bir zaman,
Qardaş tankla necə keçir
Qardaşının cəsədinin

üzərindən...
O cür azğın rəqibimiz
ola-ola,
Yerevan tək qan çanağı
dura-dura,
Bizim soydan olan kəsin,
Birdən-birə səsi gəlsin,
ƏMR versin,
– Bomba tökün Gəncəbasar
torpağına...
Nə deyəsən beləsinə,
Tutub gərək diri-diri
Boğazından çıxarasan
dərisini...
Dilini də dağlayasan,
dondurasan,
Ətini də tonqallarda
yandırasan...
Qoymayasan nə külündən
əsər qala,
Nə cismindən məzar qala...

IV

Kaş bu yaşa girməyəydim,
İçimizdə necə qorxunc
satqınlar var
görməyəydim...
Ulu xalqım qala idi xəyalımda
qəhrəmanlıq
rəmzi kimi...
Ərənlərin əreni kimi,
əzizlərin
əzizi kimi...
Həyatda da göz yumaydım
bu inamla,
Bir əbədi ehtiramla...

Görməyəydim
            vətən satan,
            torpaq satan,
Millət satan,
            bayraq
            satan,
Cəsəd satan,
            meyit satan,
Tabut satan,
            şəhid satan,
Silah satan,
            ordu satan,
Vəzifəyə
            məmləkəti,
            yurdu satan,
Ana torpaq
            od tutanda,
            alışanda,
Bu sathasat yarışında,
Belimizi sındırmaqçın,
Bu torpağı yandırmaqçın
Cəlladlara benzin satan,
            mərmi satan,
Neçə-neçə qəhrəmanı,
            mərdi satan,
Ana torpaq od tutanda,
            alışanda,
Bu sathasat yarışında,
Şəhidlərin məzarına
            qoyulan gülləri
            satan...
Mebel satan, ev satan,
            zirzəmi satan,
Balkon satan, qaraj satan,
Kitab satan, tiraj satan,
Cirə satan, zirə satan,
Şəkər satan,

kəmər satan,
Duxu satan,
güzgü satan,
daraq satan,
Dükan edib mənzilinin yarısını,
Satıcı qoyub arvadını,
baldızını,
Türsik satan, lifçik satan,
ya nimdaş
darbalaq
satan...
Bu qeyrətsiz murdarları
görməyəydim,
Kaş bu yaşa girməyəydim...
Qəlbimdəki ən müqəddəs
inamlarım ölməyəydi...

## KÜTLƏYƏ DÖNMƏ, MİLLƏTİM

Kütlənin adı kütlədi,
Kütlə xar edir milləti;
Kütlə qanmayır dost nədir,
Kütlə qanmayır yad nədir;
Kütlə çoxdankı kütlədir,
Kütləyə dönmə, millətim.
Çıxdı alimi söz deyə,
Çıxdı şairi söz deyə,
Kütlə şairi pislədi,
Kütlə onları fitlədi.
İmadəddini qətl edib,
Hadi ölümünə cəhd edib,
Böyük Sabiri rədd edib,
Kütlə çoxdankı kütlədi.
Kütləyə dönmə, millətim.
Nə beyni, nə ürəyi var,

Elə ləbbey deməyi var;
Bağırır niyə bilməyir,
Fikrini deyə bilməyir...
Yalnız kor hisslərin qulu,
Məqsədi, yolu qorxulu
Boş yerə yorur özünü,
Yoxdur məhvəri, özülü,
Çalxanır, qabarır, batır,
Büsbütün körpüdü qatı...
İşi zorladı, güclədi,
Kütlə çoxdankı kütlədi.
Məskəni çöl, bayır, küçə,
Haqqı ayaqlayıb keçər.
Dost ola, ya ki, yad ola,
Qoyar ayağı altına.
Gözləri qandı kütlənin,
Beyni dumandı kütlənin.
Hərc-mərcliyə müttəfiq,
Kütlə çoxdankı kütlədi.
Qanmaz yaxşı, yaman oldu.
Vəhşiləşir axırda o...
Yox ağlı, gücü, qüdrəti...
Kütlələrin zamanıdır,
Yalvarıram, ağıllı ol,
Kütləyə dönmə, millətim!

## SAĞLIĞINDA QİYMƏT VERİN İNSANLARA...

Bir arzum var, ay adamlar,
qoyun deyim,
Sağlığında qiymət verin insanlara,
Yaxşılara sağlığında yaxşı deyin,
Sağlığında yaman deyin yamanlara.
Yalnız, yalnız sağ olanda,
Hər kəs əsil qiymətini bilər onda;

Bu sözlərim düz olmasa
töhmət edin.
Sizdən rica eləyirəm milyon kərə,
Şairlərə sağlığında hörmət edin,
Sağlığında heykəl qoyun ölməzlərə...
Gələcəyə çox da ümid bağlamayın,
Sözünüzü sonralara saxlamayın.
Zəhləm gedir sonralardan,
Vaxtsız dinən zurnalardan,
Boşboğazdan, avaradan,
Toydan sonra nağaradan.
Sağlığında sevindirin təmizləri,
Siz həyatda bu amalla addımlayın.
Sağlığında ifşa edin xəbisləri,
Satqınlara sağlığında satqın deyin,
Tülkü deyin tülkülərə,
aslan deyin aslanlara;
Sağlığında qiymət verin insanlara...
Hər kəs bilsin öz yerini
necə sağdır,
Bu, pislərin həyatını qısaltmaqdır,
Yaxşıların həyatını uzatmaqdır...
Bu nədəndir ölən kimi, qəlbimizdə
Adamlara sevgi, hörmət aşıb-daşır.
Ölən kimi yaxşılar da yaxşılaşır,
Yamanlar da yaxşılaşır...
Çirkinlər də təmiz olur ölən kimi...
Yadlar belə əziz olur ölən kimi...
Xatirələr söyləyirik,
nekroloqlar qollayırıq,
Hamısını ucdantutma yaxşı deyib
o dünyaya yollayırıq.
Bu gecikmiş xeyir-dua kimə gərək?
Bundan məzar böyüyəcək,
ya ölənmi diriləcək?
Xoşum gəlmir
bu köhnəlmiş adətlərdən,

xoşum gəlmir...
Bu sərdaba sevgilərdən,
hörmətlərdən xoşum gəlmir.
İstəmirəm vaxt-vədəsiz şöhrəti mən,
Bir an ömrü milyon qızıl ölüm gələ,
dəyişmərəm...
Diri üçün iynə boyda hörməti mən
Ölü üçün min heykələ dəyişmərəm...
Düz deməsəm, onda məni bağışlayın,
Üz tutaram uşaqlara,
qocalara, cavanlara,
Sağlığında qiymət verin insanlara,
Yaxşılara sağ olanda yaxşı deyin,
Sağlığında yaman deyin yamanlara...

## İNANA BİLMİRƏM

İllərim ötüşür karvanlar təki,
Gah səhər görürəm, gah da ki, axşam.
İnana bilmirəm, gün gələcək ki,
Mən də bu dünyada olmayacağam.
Onlarla tanışlar ötürmüşəm mən,
Çiynimə tabutlar götürmüşəm mən.
Nə qədər adamı dəfn eləmişəm,
Bacımı, atamı dəfn eləmişəm.
Yüz yol alışmışam, odlanmışam mən,
Fəxri qarovulda dayanmışam mən,
Nə qədər ömürlər suala dönüb,
Körpələr yox olub xəyala dönüb.
Bir göz qırpımında itib tanışlar,
Sağımdan, solumdan gedib tanışlar.
Hey ürəyim qəmli, hey qanım qara,
Baxmışam sahilsiz qəbiristanlara.
Ulduzlar sanında məzar görmüşəm,
Yenə də özümü ölməz bilmişəm,
Heç inanmamışam gün gələcək ki,

Mən də köçəcəyəm milyonlar təki.
Belə qurulsa da bəşər, kainat,
Gözüm görə-görə, hər gün, hər saat.
Min ömür çatsa da sona – insanlar,
İnana bilmirəm buna – insanlar.
Sanıram üstümə ölüm gələndə,
O, mənim köksümü söküb dələndə
Hər cürə davadan, dərmandan əvvəl.
Hər cürə həkimdən, loğmandan əvvəl,
Öz sevgiləriylə, istəkləriylə.
Mənə "Ata! Ata!" deməkləriylə,
Öz baxışlarıyla, öz səsləriylə,
Öz isti, mehriban nəfəsləriylə,
Məni balalarım sağaldacaqlar,
Ölüm zülmətindən çıxardacaqlar.
Sanıram o çətin anımda mənim,
Dostlarım dayansa yanımda mənim,
Sorsalar: "Necəsən?" o əzizlərim,
Təzədən yanacaq sönən gözlərim.
Onlar əllərimdən yapışan kimi,
Durub gəzəcəyəm bir cavan kimi,
Mənə elə gəlir ən son nəfəsdə,
O cəllad duranda başımın üstə,
Sözlərim meydana girib ər kimi,
Çarpışıb, vuruşub igidlər kimi,
Gücünü, əzmini bildirəcəklər,
O qara kabusu öldürəcəklər.
Mənə elə gəlir ölüm gələndə
Bir haray düşəcək o doğma kəndə,
Eşidib, bilənlər yüyürəcəklər,
Onu boğazlayıb sürüyəcəklər.
Mənim küləklərim tüğyan edəcək,
Mənim çiçəklərim üsyan edəcək,
Mənim qartallarım millənəcəklər,
Mənim laylalarım dillənəcəklər,
Çəpərə dönəcək bənövşələrim,
Qalxacaq ayağa göy meşələrim,

Adamlar, qartallar, qayalar, dağlar,
Məni bu həyata qaytaracaqlar.
Mənə elə gəlir, varlığım, canım,
Loğmanlar loğmanı Azərbaycanım,
Ürəyi istəsə – diriləcəyəm,
Mənə oğul desə, diriləcəyəm...
İllərim ötüşür karvanlar təki,
Gah səhər görürəm, gah da ki, axşam.
İnana bilmirəm gün gələcək ki,
Mən də bu dünyada olmayacağam.
Belə qurulsa da bəşər, kainat,
Gözüm görə-görə hər gün, hər saat,
Min ömür çatsa da sona, insanlar!
İnana bilmirəm buna, insanlar!

## MƏNİM ÖLMƏZ ŞEİRLƏRİM

Xoş gəlmisiz bu dünyaya, balalarım,
Sevinclərim, əzablarım, bəlalarım.
Siz gəldiniz, bilirsiniz neylədiniz?
Oğul idim, məni ata eylədiniz.
Qəşənglərim, kifirlərim, keçəllərim,
Fərman verib
Anama da nənə adı
            bəxş eyləyən dəcəllərim.
Aşıb-daşdı evimizdə gülüşünüz,
Bilirsizmi nələr etdi gəlişiniz?
Gəlişiniz qələm çəkdi dincliyimə,
Gəlişiniz nöqtə qoydu gəncliyimə.
Siz gəldiniz, öz-özümü unutdum mən,
Siz gəldiniz, "mən" sözünü unutdum mən.
Hara getsəm indi sizi düşünürəm,
Hələ xırda, hələ qısa ömrünüzü düşünürəm.
Hara getsəm sizin üçün dən yığıram,
Nə dən yığsam üçünüzə tən yığıram.
Düşünürəm bu Müşfiqin, bu Vüqarın, bu

Mirzənin,
Bircə kərə demirəm ki, bu da mənim.
Anam deyir: – Heç özünə baxmayırsan, oğul,
tamam,
Vallah, sənə özüm paltar alasıyam.
Nə eləsin axı anam,
Onlar mənim balamdırsa,
Mən də onun balasıyam.
Çiçəksiniz, həyatımla bitirmişəm,
Bu dünyaya mən üç insan gətirmişəm,
Milyonların qabağında cavabdehəm
onlar üçün,
İstəyirəm şeir deyəm onlar üçün.
Oxusunlar ağılları kəsən zaman,
Öz oğlundan, öz qızından küsən zaman.
Salam mənim Mirzələrim, Vüqarlarım,
Müşfiqlərim,
Evimizin çıraqları – işıqlarım.
Siz ölməzlik abidəsi,
Əsrlərə gedib çatan ata səsi.
Sizin üçün gündüz əsib, gecə əsib,
Soyuqları, istiləri dilim ilə yalamışam.
Sözlərimin mən boyundan min yol kəsib,
Sizin xırda boyunuza calamışam.
Arzularım, əməllərim,
Mənə oxşar diri sözlü, diri gözlü
heykəllərim.
Yuxunuzdan duran zaman gecələri
İtirirəm sətirləri, hecaları,
dil-dil ötən ilhamım da dildən düşür,
Qoca nənə, cavan ana əldən düşür.
Mirzə, Vüqar qoymur məni ürəyimə qulaq
asam,
Kiçik Müşfiq istəmir ki, şeir yazam,
Kimə deyim bu dərdimi,
Böyük Müşfiq sağ olsaydı bu halıma
dözərdimi?!

Sizin üçün qənd alaram, bal alaram,
Min arzumu, istəyimi qanadaram.
Sizi, əziz balalarım,
Sətir-sətir böyüdürəm,
Misra-misra yaradıram.
Sevinclərim, əzablarım,
Yüz-yüz susan, yazılmayan şeirlərə
cavablarım.
Vaxt olub ki, dediyimdən dönməmişəm –
sizin üçün!
Vaxt olub ki, vəzifəli bir alçağın
Qabağında dinməmişəm sizin üçün!
Bax, bu ata əllərimlə toyunuzu edəcəyəm,
Bu dünyaya verib sizi,
Sonra sakit,
Sonra rahat, bu dünyadan gedəcəyəm.
Belə ömür mənə xoşdur.
Öz səhvini görməyənlər,
Heç nə yaza bilməyənlər
Məndən sonra desələr ki, az yazmışdır,
Onda çıxın ortalığa,
Ömrüm boyu yaratdığım şeirlərim –
işıqlarım.
Onda çıxın ortalığa,
Mirzələrim, Vüqarlarım, Müşfiqlərim!

## FÜZULİ

Şair öz yurdundan uzaqda öldü,
Öldü, bir balaca otaqda öldü.
Göz yumub yuxuya daldı Füzuli,
Vətən arzusuna çata bilmədi.
Fəqət bu xəbərdən obası, eli
İllərlə göz yumub yata bilmədi.
Onu tapşırdılar zülmət məzara,
Bütün Azərbaycan saraldı, soldu.

Gəncə başdan-başa geyindi qara,
Kəpəzin, Şah dağın gözləri doldu.
Körpə uşaq kimi tutuldu Xəzər,
Səma da ağladı, yer də ağladı.
Bakı uyumadı, mehriban şəhər,
Şirvan yasa batdı, Bərdə ağladı.
O vaxt doğma yurdu dolandı bu söz,
Dedi çöllərimiz, çəmənlərimiz,
Dedi könül verib, sevənlərimiz,
Ellərin sədası düşdü hər yana:
Gətirin şairi Azərbaycana!
Dedilər nə vaxtdır həsrətik ona:
Gətirin şairi Azərbaycana!
Uçdu Kərbəlaya xəyal atımız,
Keçdi ocağımız, söndü odumuz.
Yanıb nalə çəkdi muğamatımız,
Tellərin sədası düşdü hər yana:
Gətirin şairi Azərbaycana!

Ana torpağımız dindi insantək:
Məzarı qoynumda qazılsın gərək,
Şöhrəti alnıma yazılsın gərək,
Qoymayın ürəyim od tutub yana,
Gətirin oğlumu Azərbaycana!

Bütün söz qoşanlar, bütün əsərlər,
Nəğmələr, qoşmalar, sözlər, qəzəllər.
Füzuli şeirinin şahı – gözəllər
Dedilər nə vaxtdır həsrətik ona,
Gətirin şairi Azərbaycana!

Neçə zaman görmüş sarvanlarımız,
Neçə zınqırovlu karvanlarımız.
Qoca Kərbəlaya yol açdı o gün.
Kim bilir onların başı nə çəkdi?
O vaxt Kərbəlaya yetişmək üçün
Günü əzab dolu aylar gərəkdi.

Uyudu ərəblər torpağında o,
Nə etmək, o zaman, başqa zamandı.
Dərdli həyatının son çağında o,
Görən nə düşündü, görən nə andı?
O, bəlkə son dəfə nəfəs çəkəndə
Düşündü alnında, qəlbində qübar:
Böyük Nizamiylə doğma Vətəndə
Kaş məni yan-yana basdıraydılar!
Yada qismət oldu şöhrətim, şanım,
Sinəmdə dərdimdir, uca dağımdır?!
Bəlkə də düşündü: Azərbaycanım
Məni öz şairi sayacaqmıdır?
Şair öz yurdundan uzaqda öldü,
Öldü, bir balaca otaqda öldü.

Füzuli, qəlbimin sözünü dinlə,
Danışmaq istəyir şeirim səninlə.

Keçdi o əsrlər çənli, çisəkli,
Bu gün yurdumuzun iftixarısan.
Bu gün cavan ruhlu, cavan ürəkli
Qoca şeirimizin bayraqdarısan.
Adını söyləyir gül də, çiçək də
Şöhrətin yayılıb indi hər yana.
Şair, məzarını gətirməsək də,
Özünü gətirdik Azərbaycana!

## MƏNİM ÜRƏYİM

Dünyada nə olsa ürəyimdədir,
Bir insan sevinsə, bir gül açılsa,
Bir ömür məhv olsa, bir ev uçulsa,
Bir güllə atılsa ürəyimdədir.
Qəlbimin minlərlə guşələri var,
Bütün yer üzərində rişələri var,
O dostdur əzəldən çiçəklə, qarla,

Orda dağ ucalır, meşə uyuyur.
Mənim ürəyimdə payız baharla,
Nifrət məhəbbətlə qoşa uyuyur.
Orda milyonların dərdi, istəyi,
Silah bazaları, körpələr evi,
Hicran saatları, görüş anları,
Bütün sevgilərin meridianları,
Mənim ürəyimi mərkəz seçirlər.
Mənim ürəyimdən gəlib keçirlər.
Sakit okeana atılan atom,
Min insan səsini batıran atom,
Yandırıb sinəmi deşdi ilk dəfə,
Mənim ürəyimə düşdü ilk dəfə.
Daim sevgi deyir, məhəbbət deyir,
Nurunu axıdır ürəyim mənim.
Sanki yumruq boyda yumşaq ət deyil,
Dünyanın oxudur ürəyim mənim.
Onun göyləri var dərindən-dərin,
Hisslər tufanıdır, hisslər mehidir,
Bütün dahilərin, sərkərdələrin,
Sevgidən tökülmüş mavzoleyidir.
Onun min axarı, min baxarı var,
Əks edir torpağın, göyün səsini,
Onun radio tək dalğaları var,
Tutur yer üzünün hər nöqtəsini.
İnsanlar sevinsə, gülsə, çağlasa,
Coşar Kür ürəyim, Volqa ürəyim,
Kim isə, hardasa, dolsa, ağlasa,
Tutar fəryadını dalğa ürəyim.
Kasıb ürəyimin dalğalarında,
Cənab ürəyimin dalğalarında,
Şimal ürəyimin dalğalarında,
Cənub ürəyimin dalğalarında,
Orda atomların gurultuları,
Orda sevənlərin pıçıltıları,
Neçə igid səsi, ər səsidir o,
Bəşərin mənəvi mərkəzidir o.

O canlı, duyğulu insan kimidir,
Vardır həm sevinci, həm kədəri də,
Ürəyim bir teleekran kimidir,
Göstərir ən xırda ölkələri də.
Hər an, hər saniyə görünür orda,
Raketlər qəlbimin ekranlarında.
Buketlər qəlbimin ekranlarında,
Yurdsuzlar qəlbimin ekranlarında.
Böyük planeti hifz eləyir o,
Harda nə olursa, hiss eləyir o.
Köksümü dünyaya çevirirəm mən,
Ürəyə bənzəyir, cahan deyirlər.
Bununçun sevirəm, sevinirəm mən,
Bununçun adıma insan deyirlər.

## YUXUMDA O TAYA KEÇDİM BU GECƏ

Yuxumda o taya keçdim bu gecə,
Sandım ki, sevincim göylərlə təndir.
Yuxumda o taya keçdim bu gecə,
Gördüm ki, sərhədlər pərən-pərəndir.

Cızıqlar üstündə açmış çiçəklər,
Məftillər ayrılıb küsüşmüşdülər.
Bir vaxt lovğalanan dəmir dirəklər,
İndi yetim kimi büzüşmüşdülər.

Azad dolaşırdı çiçək də, gül də,
Yas tutub ağlayan göz qalmamışdı.
Kədərdən, möhnətdən bu doğma yerdə,
Əsər qalmamışdı, iz qalmamışdı.

Sevinc dolaşırdı torpağı, daşı,
Qüssə uzaq qaçır, kənardan gedir.
Lövhələr deyirdi hər addımbaşı:
Təbrizə, Mərəndə yol hardan gedir.

Bu yuxu nə yaxşı mənə tuş oldu,
O min həqiqətdən dadlı deyilmi?
Yarım insan oldu, yarım quş oldu,
Uçdum düz Bakıdan Təbrizə kimi.

Ürək ayrılmadı öz istəyindən,
Sevincim hicranın bağrın dəlirdi.
Təbriz, hər daşından, hər kəsəyindən,
Doğma Azərbaycan ətri gəlirdi!

Sözlər Azərbaycan sözləri idi,
Gözlər Azərbaycan gözləri idi.

Könlümü oxşadı hər ev, hər dalan,
Uşaq da, böyük də, gənc də, qarı da.
Sandım ki, Təbrizin bu saat, bu an,
Bakı səmasıdır səmaları da.

Hər şey öz ruhumuz, öz dəbimizcə,
Şeirlər dinirdi öz təbimizcə.
Körpələr bizimcə ana deyirdi,
Qızlar azəricə gülümsəyirdi.

Qərib saymadılar Təbrizdə məni,
Deyin, qərib idim Təbrizdə yəni?!
Təbriz... alçaq evlər, enli küçələr,
Bir-bir gözlərimdən gəlib sovuşdu.

Hələ yaxınlaşıb mənə bir nəfər:
– Filan yer hardadır?– ünvan soruşdu.
Qoy deyim yuxumda sonra nə gördüm,
Şirin, unudulmaz bir səhnə gördüm.

Gördüm ki, bu taydan o taya düşdüm,
Aşıqlı, nəğməli bir toya düşdüm.
Burda saymadılar özgəsi məni,
Doyunca oynatdı toy yiyəsi məni.

Sonra aşıq qardaş dastan başladı,
Sözü üç vəfalı dostdan başladı.
Astaca-astaca dedi hərdən o,
Qanımdan yaranan nəğmələrdən o.

Gah bahar dil açdı, gah yay dil açdı.
O tayın diliylə bu tay dil açdı.
Sonra bir-birinə qarışdı taylar,
Görüşdü, öpüşdü, barışdı taylar.

Günün şəfəqləri yayılan zaman,
Bu şirin yuxudan ayılan zaman,
Gördüm nə toydayam, nə Təbrizdəyəm,
Gördüm bu taydakı evimizdəyəm.

Yox idi o məclis, yox idi aşıq,
Sən demə, xəyalıydı, yuxuydu aşıq.
Dərin fikirlərə cumdum, olmadı,
Min yol gözlərimi yumdum, olmadı.

Yuxumda o taya keçdim bu gecə,
Kaş ondan, kaş ondan ayrılmayaydım.
Yuxumda o taya keçdim bu gecə,
Kaş ondan heç zaman ayrılmayaydım.

## MƏNİMÇİN

*Şeir qürbət ellərdə mənimlə birgə addımlayan dostum Yəhya Məmmədova müraciətlə yazılıbdır.*

Sən onsuz da əziz idin yad eldə,
Ən qiymətli bir insansan mənimçin.
Sən onsuz da əvəzsizdin, yad eldə,
Doğma göysən, asimansan mənimçin.

Bu qürbətdə milyonların içində,
İşığımsan, dumanların içində,
Arzuların, gümanların içində,
Sən yeganə bir gümansan, mənimçin.

Həsrət gücü dizlərimi qatlayıb,
Bir nəğmə de, vallah bağrım çatlayır.
Necə edim, okeanlar adlayım,
Bir tədbir tök, olsun asan mənimçin.

Torpağımın tikanına qurbanam,
Ən gərəksiz insanına qurbanam,
Günəşinə, dumanına qurbanam,
Kainatdır Azərbaycan mənimçin.

Sənsən şeirim, sənsən dilim yad eldə,
Sən də gül ki, mən də gülüm yad eldə.
Əgər gəlsə qəfil ölüm yad eldə,
Elə bircə sən yanansan mənimçin.

Ürəyimdir gizli-gizli ağlayan,
Bu Londonda sənsən məni saxlayan,
Sənsən məni yerə-göyə bağlayan,
Həm mələksən, həm inamsan mənimçin.

Uzaq getmə, mənim ilə addımla,
Qəriblikdir danışmayır adamla.
Sən bu saat familinlə, adınla,
Vətən adlı bir imansan mənimçin.

## NƏSİMİ

Nəsimi taleyi gərəkdir mənə,
Adımı vüqarla daşımaq üçün.
Nəsimi taleyi gərəkdir mənə,
Həyatda mərdanə yaşamaq üçün.

Özümü, sözümü böyük sanmağa,
Əslimlə, nəslimlə qürurlanmağa,
Ən ağır saatda, ən çətin gündə,
Əsil qoçaqlıqla yerimək üçün.
Şairlər yanında, ərlər içində,
Başıucalıqla yerimək üçün.
Nəsimi taleyi gərəkdir mənə,
Təbrizin bağlanmış yolları kimi,
Nəsimi taleyi gərəkdir mənə,
Babəkin kəsilmiş qolları kimi,
İyirmialtıların ürəyi kimi.
Anamın ağarmış birçəyi kimi,
Kəpəzim, Şahdağım, Qoşqarım kimi,
Doğma tarım kimi, çinarım kimi,
Bu qüdrətli ölüm, bu bəxt, bu yazı,
Bu sevinc, bu kədər gərəkdir mənə.
Nəsimi taleyi, Nəsimi yası,
Doğma dilim qədər gərəkdir mənə.
Deyirəm: bu ölməz ölümə alqış,
Heç zaman basılmaz bir ordumdur o.
Əsrlər köksünə qanla yazılmış,
İlkin vəsiqəmdir, pasportumdur o.
Güclə boğazıma dirənənləri,
Şöhrətçin əl açıb dilənənləri,
Vətəndə vətənsiz yaşayanları,
Elə mənsiz, sənsiz yaşayanları,
Ölü cəsədləri, ölü canları,
İnsan qiyafəli soxulcanları
Niyə gəldiyini, doğulduğunu,
Unuda-unuda yaşayanları,
Elə tıxa-tıxa ömrü uzunu,
Elə uda-uda yaşayanları,
Didib parçalayıb öldürmək üçün,
Nəsimi taleyi gərəkdir mənə.
Aləmi onlara güldürmək üçün,
Nəsimi taleyi gərəkdir mənə.
O ölüm xalqımın ucalığıdır,

O ölüm xalqımın bacarığıdır.
Ən uca, ən yüksək zirvəmdir mənim,
Qorxaq adamlara zərbəmdir mənim.
Milli qürurumdur, məhəbbətimdir,
Bu ulu faciə səadətimdir.
Nəsimi taleyi gərəkdir mənə
Şeirimin, sözümün qüdrəti üçün.
Nəsimi taleyi gərəkdir mənə
Şairlə düzlüyün birliyi üçün,
Şairlə mərdliyin vəhdəti üçün.

## ƏN ƏZİZ, ƏN ŞİRİN, ƏN UCA GÜNLƏR...

*Cənublu şair dostum Söhrab Tahirin anası*
*Nəsibənin Bakıya qonaq gəlməsi münasibətilə*

Nə gözəl aylardı, həftələr idi,
Səninçin, ay Söhrab, analı günlər,
Gözünə görüşdən sürmə çəkilən,
Barmağı öpüşdən xınalı günlər,
O tayın, bu tayın daş həsrətindən
Tamam uzaq günlər, aralı günlər,
Bütün Azərbaycan torpağı üçün
Doğma, əziz günlər, mənalı günlər.

***

On iki milyonlıq qardaş-bacının,
Sözüylə, adıyla gəlmişdi ana,
Azadlıq yolunda ölən ərlərin
Odlu fəryadıyla gəlmişdi ana,
Üzünə baxanda elə bilirdin
Göyün üstü ilə gəlmişdi ana,
Yerin altı ilə gəlmişdi ana,
Raketlər əsrində beş addım yolu
İyirmi altı ilə gəlmişdi ana.

***

Ana bala ilə olar, biz isə
Anası bu taya gəlib deyərdik,
Hələ qürur ilə, iftixar ilə
Özü də üç aya gəlib deyərdik,
Həştad yaşlı qarı, qırx yaşlı kişi
Təzədən dünyaya gəlib deyərdik.
Doğma övladını görməkçün yazıq
Bir qərinədir ki, şikayət yazıb,
Yalvara-yalvara gəlib deyərdik,
Ağlaya-ağlaya gəlib deyərdik.

***

Ömrünün ən rahat anları idi
Düz üç ay yuxusuz qaldığın anlar,
Ana gülüşünə, ana sözünə,
Ana söhbətinə daldığın anlar,
Bu yekə vaxtında yerini, qardaş,
Anayla yan-yana saldığın anlar,
Ən böyük dərdini, böyük yaranı
"Oğul" kəlməsiylə sarıdığın anlar...
İndi ürək sökən xatirə olub
Sükutlu, nəğməli, çalğılı anlar.

***

Sizə yığışardıq tez-tez, əzizim,
Şeirli, gülüşlü, məclisli idik,
Biz ancaq anaya durub baxırdıq,
Yüz baxışlı idik, yüz gözlü idik,
Dili ana dilim, nə xoş, nə təmiz,
Sözləri nə şirin, nə duzlu idi.
Bakılı, Mərəndli, Xoylu, Qubalı,
Bərdəli, Ağdamlı, Təbrizli idik,
Sən bu taylı idin, mənsə o taylı,

Nə fərqi, həm sizli, həm bizli idik,
Nə xoş yerlər idi, mahallar idi,
Ananın ayağı toxunan yerlər,
Bu şirin həsrətə, şirin görüşə,
Bu şirin vüsala yığılan yerlər,
Ən uca dağlardan ucadır bu gün
Onun qədəminə yıxılan yerlər,
O gedəndən bəri dolan, boşalan,
Qovrulan, darıxan, sıxılan yerlər,
İndi xəyalının ekranlarında
Hicran lenti ilə baxılan yerlər.

***

Nə ağır anlardı, dəqiqələrdi,
Onun getməyinə az qalan günlər.
Açıb cəhəngini əjdaha kimi
Hər gün vüsal udan aziman günlər,
Düşüb qətrə-qətrə, damcıbadamcı,
Sızıb gilə-gilə azalan günlər,
Başının üstündən ağır daş kimi,
Qara bayraq kimi asılan günlər,
İndi bahar olub, qaranquş olub
O şirin, o əziz, o acı günlər,
İkiyə bölünmüş ürəyimizin
Həkimi, dərmanı, əlacı günlər.

## ZİRVƏLƏRDƏYƏM

Zirvələrdəyəm...
Dərələrdən duman sürünür...
Səmalardan qatar-qatar buludlar köçür.
Aşağıdan yuxarılar böyük görünür,
Yuxarıdan aşağılar balaca, kiçik...

Uca dağlar, uçurumlar ruhuma həmdəm,
Sıldırımlı qayalardır çəkən fikrimi.

Sanıram ki, bir basılmaz gücəm, qüvvətəm,
Bərqəraram yerin, göyün hakimi kimi.

Məni burdan yıxan olmaz, tərpədən olmaz,
Sanıram ki, mənimkidir bu zirvə çoxdan.
Lap Allahın özü gəlsə, mənə tən olmaz,
Unuduram amma necə buraya çıxdım...
Gah süründüm, gah yıxıldım –
            gördü çoxları,
Gah yalvardım taleyimə, gah dinməz oldum.
Nə zaman ki, diş-dırnaqla qalxdım yuxarı
Birdən-birə mən dəyişdim, ayrı kəs oldum...

Dağlar ilə dayanmışam indi yanaşı,
Qartallar da həsəd ilə mənə baxırlar.
Aşağılar gözlərimdə balacalaşıb,
Cılızlaşıb nəzərimdə yollar, cığırlar...

Qəribədir bu dünyanın yönü, görümü,
Nəsillərin arxasınca nəsillər köçüb,

Aşağıdan yuxarılar böyük görünüb,
Yuxarıdan aşağılar balaca, kiçik...

Yekələrin gözlərində "xırda" görünməz,
Düzənlərin qarşısını qayalar kəsir.
Bu dağların, bu çayların yaşı bilinməz,
Bapbalaca təpəciyin ömrü min əsr...
Qərinələr uçub gedib hey yeyin-yeyin,
Bir gün göydən nur tökülüb,
            bir gün yağıb qar.
Məndən əvvəl bu zirvədə duranlar yəqin
Yuxarıdan aşağıya belə baxıblar.

Bəli, belə dövr eyləyir həyat, görünür,
Beləcədir bu dünyanın bayırı, içi...
Aşağıdan yuxarılar böyük görünür,
Yuxarıdan aşağılar balaca, kiçik...

## ONDA KÜLÇƏ İDİM...

Bu yerdə bir zaman adi uşaqdım,
Toz-torpaq içində eşələnərdim.
Gözü açılmamış sısqa bulaqdım,
Elə öz-özümə nəşələnərdim.
Bir parça od idim, bir parça alov,
Kim dinsə üstünə kişilənərdim.
Laylam şəlalənin, çayın gur səsi,
Hələ külçə idim, şeir külçəsi.
Misramın dan yeri sökülməmişdi
Hələ adlı-sanlı vəzifələrdən,
Üstümə rəsmilik tökülməmişdi.
Nə soyuq təfəkkür dinərdi, nə də,
Alimlik yağardı şeirlərimdən.
Nə kosmos, nə infarkt, nə aerodrom,
Nə raketlər var idi şeirlərimdə.
Dünya mənim üçün maraqda idi,
Hələ məhəbbətim qabaqda idi,
Hələ kin-nifrətim qabaqda idi.
Təzə başlanırdı tərcümeyi-halım,
Ömrümün günləri sayılmamışdı.
Hələ varlığımın dərinliyində
Şöhrət duyğuları ayılmamışdı.
Büsbütün həyatdım alovlu, qaynar,
Qanıma soyuqluq yayılmamışdı.
Sadə adamlardan biriydim elə,
Dostlarım kim idi: Qəribağa, Adil,
Dostlarım kimi idi: Gülağa lələ,
Rəqibim kim idi: Mirzağa, Hadi...
Sadəlik işimdə, hərəkətimdə,
Sadəlik özümün bərəkətimdə,
Sadəlik fikrimin çaparlarında,
Sadəlik misramın çalarlarında,
Nə bəzi adamlar mənə əyilər,
Nə də təriflərə bələyərdilər.
Nə çox şərəfimə sağlıq deyilər,
Nə minnətli hörmət eləyərdilər.

“Qohumum” az idi, “dostum” az idi,
Kimsədən seçilməz, ayrılmaz idim.
Nə mənim başıma dolanırdılar,
Nə məni görəndə utanırdılar,
Nə məndən sirrini gizləyərdilər,
Nə durub yolumu gözləyərdilər...
Nə imzam, nə qolum var idi onda,
Nə adım, titulum var idi onda.
Ürəkdə yansa da məhəbbətləri,
Çoxları heç məni görməzdi əsla.
Nə də kəndimizin sayıq itləri
Üstümə bu qədər hürməzdi əsla.
Qızıl nur yağardı ocağımızdan,
Durub kənarında hey düşünərdim.
Çıxardım balaca otağımızdan,
Gəzib dolanardım, geri dönərdim.
Sadə adamlardan biriydim elə,
Dostlarım kim idi: Qəribağa, Adil,
Dostlarım kimi idi: Gülağa lələ,
Rəqibim kim idi: Mirzağa, Hadi,
Düşmənim də adi, dostum da adi,
Adi adam idim, adidən adi...

## AY ANA...

Sənin qızın, mənim ömür yoldaşım,
Əlimizdən nə tez uçdu, ay ana?..
Heç bilmirəm bu əzrayıl mürdəşir,
Birdən niyə onu seçdi, ay ana?...

O, gedəli gücüm yox, qüdrətim yox,
Bu həyata zərrə məhəbbətim yox,
Oğullarım qalmadılar yetim, yox,
O yetimlik mənə düşdü, ay ana...

Elə bil ki, nəslimizdə talan var,
Baxışlarda gör nə boyda ələm var,

O gedəli gör nə qədər ölən var,
O gedəli köçhaköçdür, ay ana?..

Sənin saçın birdən-birə ağardı,
Mənim ömrüm viran oldu, dağıldı,
İnsan tamam əfsanədir, nağıldır,
Əvvəli heç, sonu heçdir, ay ana...

Səfurəmin anasısan – anamsan,
Sən də ona mənim kimi yanansan,
O gedəli sən də ömrü talansan,
Yaşayırsan gözü yaşlı, ay ana...

Günlərimi təklik alıb qoynuna,
O iblisdir ilişmişəm oyununa,
İstər gələ yüz-yüz gəlin-qaynana,
Ocağımız daha boşdur, ay ana...

Lap mələklər xidmət edə bu evə,
Peyğəmbərlər hörmət edə bu evə,
Allah özü diqqət edə bu evə,
Səfurəsiz yenə heçdir, ay ana...

## DAVALAR...DAVALAR...

Yer üzündə od qalayan
davaların çoxdur sayı,
Çoxömürlü müharibə
çörək, qarın davasıdır...
Çox davalar qalxıb, yatıb,
bu hərb də onların tayı,
Əsil dava varlılarla
kasıbların davasıdır.
Ehtiyacla vuruşdadır,
döyüşdədir daim bəşər,
İmkansızlar qarşısında

baş əyirlər qiblə kimi.
Bir Domokl qılıncı tək
asılmada o həmişə,
İnsanlığın başı üstdən
ta beşikdən qəbrə kimi...
Ən əyilməz oğulları
o sındırır, əsir edir,
Savaşların pis savaşı
toxun, acın davasıdır...
O nə qədər ölkələri,
millətləri rəzil edib,
Tükənməyən dava-qırğın
ehtiyacın davasıdır...
Çəkişmələr, kəşməkəşlər,
pul üstündə, var üstündə,
Ata, oğul olur düşmən
pul üstündə, var üstündə,
Çox həmlələr, təhlükələr
pul üstündə, var üstündə,
Dilə gəlib ilk güllələr
pul üstündə, var üstündə...
Milyonlarla baş vurulub
nəfsə görə, xeyrə görə,
Tamahkarın işi-gücü
gümüş, qızıl davasıdır.
Siz söyləyin kim o qızıl, gümüşlərdən
xeyir görüb?
Fəqət qızıl-zər davası
bəşərin zor davasıdır...
Davanın da adam kimi
yaşı olur, günü olur,
Bir doğulan günü olur,
bir yox olan günü olur...
Xalqlar qövlü-qal istəməz,
dağ yeriyə lap dağ üstə,
Başçılardır qanlar tökən
mənsəb üstə, maraq üstə...

Başsızların əmri ilə
milyonla baş qurban gedib,
Bu davalar nə istiqlal,
nə hürriyyət davasıdır...
Say-hesabsız həyat sönüb,
dəryalarca al-qan gedib,
Davaların ən qanlısı
hakimiyyət davasıdır...
Bir səngərdə qədim "İncil",
bir səngərdə ulu "Quran",
Bir səngərdə haqq-ədalət,
bir səngərdə zülm, talan,
Bir tərəfdə məkr, zülmət,
bir yanda nur daşıyanlar,
Bir cəbhədə öldürənlər,
bir cəbhədə yaşadanlar...
Bir qütbdə şeytan durur,
bir qütbdə Allah, Kəbə,
Bu büsbütün dövrlərin,
əsrlərin davasıdır...
Dünya qərar tutan gündən,
ən kəsilməz müharibə,
Vicdanların, məsləklərin,
xeyirin-şərin davasıdır...

## MƏN NECƏ YAŞAYIM ÖLÜ GÜNLƏRİ

Sən məni təkliyin aldın əlindən,
Təzədən təkliyə düçar eylədin.
Özün kövrəkliyin alıb əlindən,
Özün kövrəkliyə düçar eylədin...

Ömrümün, günümün bu qürub çağı,
Ruhumda baharı göyərdə bildin.
Könlümdə qaralan odu, ocağı,
Təzədən yandırıb közərdə bildin.

Təzədən açıldı qolum, qanadım,
Təzədən od saldım sənin odundan.
Hətta saçlarıma məhəl qoymadım,
Hətta yaş həddi də çıxdı yadımdan.

Qələmi, dəftəri qoydum bir yana,
Az qala ilhamı yaddan çıxartdım.
Səpdim günlərimi ayaqlarına,
Adınla oyandım, adınla yatdım...

Demə bu məhəbbət, demə bu sevgi,
Ötəri hiss imiş, ötəri həvəs.
Yox imiş təməli, yox imiş kökü,
Dəyəri bir qara qəpiyə dəyməz.

Özün bu sevdaya sövq etdin məni,
Sonra öz əlinlə özün dağıtdın,
Özün bu hicrana öyrətdin məni,
Özün bu kitabı açdın, bağladın.

Özün də axırda dandın sözünü,
O andlar, amanlar de, harda qaldı?
Sən gəldin, yollardan çəkdim gözümü,
Sən getdin, gözlərim yollarda qaldı...

Yenə də tuş oldum qəmə əzizim,
Soldu bağçalarım, soldu bağlarım.
Tənhalıq ölümmüş demə, əzizim,
Mən necə yaşayım ölü günləri?!

## MƏNİ TONQALDA YANDIRIN...

Nəyimiz var alt-üst oldu,
Bu boyda millət xar oldu.
Bütün yaxşılar pis oldu,
Ümidlər tarı-mar oldu.

Həyat baha, ölüm ucuz,
Qarı düşmən vəhşi, quduz.
Qeyrətimiz, namusumuz,
Tapdandı, payimal oldu...

Bu torpağı addım-addım,
Öz satqınlarımız satdı.
Çoxu da "ağ günə" çatdı,
Sahibi-ixtiyar oldu...

Xalqım yurd-yuvasız qaçaq,
Şuşam yad ellərdə dustaq,
Ondan sonra papaq qoymaq,
Hər bir erkəyə ar olsun...

Qəddim əyri, üzüm qara,
Məmləkətim para-para.
Bu davadan bizə qalan,
Min-min nakam məzar oldu...

Əqidədən döndü hamı,
Baş girləyir indi hamı,
İçəridən sındı hamı,
Bu ən qorxunc azar oldu...

Möhtəkirlər ordu-ordu,
Alverçilər tutub yurdu,
Dükanlardan qala qurduq,
Azərbaycan bazar oldu...

Böyük Allah, dahi Allah,
Dözmək olmur daha Allah,
Şəhid oldu ideallar,
Ta dollar ideal oldu...

Nə sirdir məni qandırın,
Bakım qürbəti andırır,
Məni tonqalda yandırın,
Qoy vətən laləzar olsun...

## DÜNYA DOLLAR XƏSTƏSİDİR

Dünya dollar xəstəsidir
Hamı ona əsir-yesir.
Dərinə işləyib kökü,
O bütün qəlblərə çöküb,
Bütün vicdanları çapıb,
O dolaşır küçə-küçə, qapı-qapı
Nə dərmanı, davası var.
Ərzdə dollar davası var.
Əl boyda kağızdır özü.
Amma hamı xəstəsidir.
Səsin çatanacan bağır,
Bütün allahları çağır,
Bütün loğmanları çağır,
Bütün fələkləri səslə,
Bütün arzuları izlə,
Bütün fikirləri sapla,
Ölünü, sağı cavabda,
İblisi, şeytanı dindir,
Rumili, firəngli, hindli,
Ağlar, qaralar, sarılar,
Onun əlində yaralı,
Onun əlində oyuncaq,
Odur haqq, ədalət ancaq.
Hamı qabağında əsir,
Dünya dollar xəstəsidir.
Beyinləri silkələyib,
Yeyib bütün sikkələri,
Əskinasları öldürüb,
Bu əsrin kağız quldurU.
Zaman məhvərindən dənə
Qızıl-zər davası tələ,
Onun davası səngiməz,
Dövlətlər keçib cənginə,
Şahlar qabağında rəzil,

Dünya dollar xəstəsidir.
Uğrunda tökülür qanlar,
Ölü məhv edir dirini,
Onun üstündə insanlar,
Çapırlar bir-birini.
Ucadır haqdan, Allahdan,
Bütün tamahlar quludur,
O hər cürə silahdan,
Təcavüzdən qorxuludur.
Bir göy kağızın uğrunda
Analar keçir oğlundan,
Satqınlar keçir vətəndən,
Başlar ayrılır bədəndən.
Əllər əllərdən üzülür,
Gözəllər satır özünü,
Kasıbların baxtı çalıb,
Onlar bu dərddən uzaqdır.
Onlar bu döyüşdə qalib,
Kasıbın da varmış baxtı?!
Amerika yer üzünü
Bir göy kağızla zəbt eyləyib,
Amerika yer üzünü dollar ilə zəbt eyləyib,
Yer də, göy də bürünübdür dumanına,
Bitməyəcək onun qorxunc davaları.
O sağalmaz mərəzidir zəmanənin,
Amerika onun ilə havalıdır.
Sərkərdələr qabağında əsir-yesir,
Prezidentlər qabağında əsir-yesir,
Məmləkətlər qabağında əsir-yesir,
Dünya dollar xəstəsidir.
Köhnə dünya təzə dərdə düçar olub.
Bu ən qorxunc azar olub,
Yayılacaq dövr-dövr, nəsil-nəsil,
Amerika gecə-gündüz dollar kəsir.
Yer üzünə yayır qəsdən
Aman-aman bu mərəzdən.
Ayıq olun, ey insanlar,

Sayıq olun, ey insanlar,
Zamanın haray səsidir,
Dünya dollar xəstəsidir,
Dünya dollar xəstəsidir

## ADAM ADAM OĞURLAYIR

Zamanın dönübdü üzü
Adam adam oğurlayır.
Heç vaxt görməyib yer üzü
Adam adam oğurlayır.

Hamı olub əsir-yesir,
Qorxur, evinə tələsir.
Adam adam başı kəsir,
Adam adam oğurlayır.

Hər cürə talan görmüşük,
Hər cür qan salan görmüşük,
Bəs bunu haçan görmüşük,
Adam adam oğurlayır.

Tükənib insanlıq eşqi,
Bəşər xəstə, zaman düşkün,
Bu da əsrin təzə kəşfi,
Adam adam oğurlayır.

Adam doğanlara deyim,
Doğub boğanlara deyim,
Vəhşi insanlara deyim
Adam adam oğurlayır.

Ayı qoz, fındıq aparır,
Qurd yağlı quyruq aparır,
Tülkü də toyuq aparır,
Adam adam oğurlayır.

Qara divin səsi gəlir,
Körpə mələşməsi gəlir,
Adam-madam iyisi gəlir,
Adam adam oğurlayır.

Qalxın məzarda yatanlar,
İnsanı uca tutanlar,
Ayıq olun, ey adamlar,
Adam adam oğurlayır.

Bundan o yanası yoxdur,
Ta ömrün mənası yoxdur,
Bəşərin anası yoxmu,
Adam adam oğurlayır.

## YOLA SALIN AYA MƏNİ...

Mehriban anam gətirdi,
Bir gün bu dünyaya məni.
Bu sırtıq, qorxunc, məkrli,
Bu miskin dünyaya məni.

Şeirlə açıldı dilim,
Şairlik dərd, əzab, zülm.
Nə üçün saldın, de görüm,
Tanrım, bu bəlaya məni.

Qələmimlə mən biçarə,
Çox sədləri yara-yara,
Girdim bu qara bazara,
Aldılar araya məni.

Gördüm, bura palçıq, çamır,
Saymayır adam adamı.
Şan-şöhrət acıdır hamı,
Sarsıtdı bu "qayə" məni.

Ocaq çatdım, köz elədim,
Vardan-yoxdan söz elədim.
Çox şeydən pəhriz elədim,
Sıxdı abır-həya məni.

Yazıqlar olsun, yazıqlar,
İlhamsızlar, ziyasızlar,
Abırsızlar, həyasızlar,
Almadımı saya məni.

Yerdə gördüklərim yetər,
Şirini acıdan betər.
Qoyun uçağa, raketə,
Yola salın aya məni.

## BİZ SƏNİ DAĞ BİLİRDİK

Biz səni dağ bilirdik,
sən heç təpə deyilsən.
Səni ümman bilirdik,
sən heç ləpə deyilsən.
Biz sənə dost deyirdik,
sən yad imişsən, demə.
Səni kişi bilirdik,
arvad imişsən, demə,
Əvvəl elə sanırdıq
təmizlərin təmizisən,
Sonra gördük, anladıq,
sən çirkinlik rəmzisən.
Çox artistlik eləmə,
yoxsa sənə göz dəyər,
Adam necə özünü
maskalayar, gizləyər.
Həqiqət gözümüzdə
durubdur röya kimi,
Arxasız imişik biz,
demə, buraya kimi.

## DÖZMƏK OLMUR DAHA XALQIM

Bu gəlir, aldadır xalqı,
O gəlir, aldadır xalqı...
Gör nə yaman günə qalıb,
Gör ki, nə haldadır xalqım...

İlanla da dolanandı,
Əqrəblə də dil tapandı,
İblisə də inandı,
Səbr, inam dağı xalqım...

Gəmisi var, sükanı yox,
Sərvəti var, imkanı yox,
Vətəni var, baxanı yox,
Kim belə qarğayıb xalqı.

Binayi-qədimdən qardaş,
Ərzi icarə edir baş,
Biz hisslər əsiriyik – kaş,
Kaş olaydıq ağıl xalqı.

Çox-çox xanı, çox-çox bəyi,
O qaldırıb mərtəbəyə,
Onlar da xalq deyə-deyə,
Gecə-gündüz sağıb xalqı.

Mərddən artıqdı namərdi,
Dərdi çox, yoxdur həmdərdi,
hər gün başına göylərdən,
Öz daşındır yağır xalqım...

Nə qədər qanlı dişlər var,
Nə qədər çirkin işlər var,
Dünyada dost var, düşmən var,
Bizə durub baxır xalqım...

Nə qədər biqeyrət olar,
Nə qədər xəyanət olar,
Nə qədər müsibət olar,
Dözmək olmur daha xalqım...

Düşmənimiz özümüzdən,
Ya Rəbb, qoru bizi bizdən,
Bu ləkəni üstümüzdən,
Kim siləcək axı, xalqım?!

## “ŞEİR DEYİR...”

Gündə bu saqqallı qağa,
Qazdı-qazdı şeir deyir.
Başında bir lotu papaq,
Qumarbazdı şeir deyir.

***

Ağzına nə gəlir yazır,
Yoxdu bir fərli misrası.
Şikayət, donos ustası,
Ərzəbazdı, şeir deyir.

***

Sənət yaranır qüdrətdən,
Bu sözü salıb hörmətdən.
Tamada olur sünnətdə,
Toyda, yasda şeir deyir.

***

Bir hektarlıq qulağı var,
Yekə, qalın dodağı var.
Qaytağı oynamağı var,
Kəndirbazdı, şeir deyir.

***

Qafiyələr köhnə, cındır,
Məna yoxdur, ha baş sındır.
İy də qanmır, zalım-sındıq,
İyli, paslı şeir deyir.

***

Başına salan yox noxa,
Gəl, indi ağzını axtar,
Coşur hər bir yığıncaqda,
Hər iclasda şeir deyir.

***

Ayağın altın görməyir,
Əriyib, itib ölməyir,
Üç kəlmə rusca bilməyir,
Hətta rusca şeir deyir.

***

Adı əyil oğlu əyil,
Rütbəli gördü, baş əyir.
Hər qulluğa, vəzifəyə,
Hər cür posta şeir deyir.

***

Heç lazım olmayan yerdə,
Ağzın açır hərzə-hərzə.
Məsciddə, minbərdə, pirdə,
Qüsl-namazda şeir deyir.

***

Adam baxır, od götürür,
Kütlə ağlını itirib,
Füzuli, Sabir yetirən,
Xalq da ona şair deyir.

# ÖLMƏK HÜQUQUNDAN QEYRİ...

Ölülər sağ, sağ ölü,
Bu nə cürə zəmanədir...
Fitrətində yerin, göyün,
Pozulubdur müvazinət...
Dünənimiz sabahsızdır,
Bu günümüz binəsibdir.
Müqəssirlər günahsızdır,
Günahsızlar müqəssirdir.
Heyif, qalanlara, heyif
Ey yatanlar, ayıq olun,
Bir ləkəsiz bəşər deyin,
Heykəlini qoyaq onun...
Hamı laqeyd, biganədir,
Bu nə cürə zəmanədir...
Natəmizlər salıb şərə,
Təmizləri süpürdülər,
Ölüləri dirildirlər,
Diriləri öldürürlər.
Xilasımız ağlamaqdır,
Himnimiz də mərsiyədir...
Bütün işlər baş-ayaqdır,
Bütün sözlər tərsinədir...
Biz hürriyyət deyə-deyə,
Qayıdırıq köləliyə...
Biz gələcək deyə-deyə,
Keçmiş çıxır irəliyə.
Dərd əlindən dağa cumub,
Nə qədər bəlalı qaçır.
Əyrilər qabağa cumur,
Düzlər dalı-dalı qaçır...
Bütün üzlər olub astar,
Bəylik, xanlıq, qoçuluqdur...
Mənəviyyat dünyamızda,

Kasıblıqdır, yolçuluqdur...
Dağılıbdır bütün sədlər.
Qalanıb dərdlər üst-üstə...
Fəlakət də, müsibət də,
Bir-biriylə bəhsə-bəhsdə...
Qeyrəti, namusu atıb,
Qarabağı verdik yada...
Kişilərə ləçək, yaylıq,
Papaq verin arvadlara...
Tüpürüblər məhəbbətə,
İndi hamı pul axtarır...
Qızlar düşüb məzənnədən,
Bəylər varlı dul axtarır...
Dovşanı qaç, ovçuya vur,
Tazıya hür öyrədirlər...
Dilləri dilsiz qoyur,
Lallara dil öyrədirlər...
Düz danışan yazarları,
Ehtiyacla şərlədilər.
Bala-bala azarladıb,
Bala-bala çərlədirər...
Millətin qırılıb beli,
Millət quruca söz olub.
Ölmək hüququndan qeyri,
Bütün hüquqlar pozulub...

## BİR ADDIM...

Məhəbbətdən nifrətə yol bir addım,
Yaltaqlıqdan minnətə yol bir addım.
Gəldi-gedər bir qalağıq cahanda,
Heç fərqinə varmamışıq bir an da,
Ki, həyatdan ölümə yol bir addım,
Son mənzilə dönümə yol bir addım.
Ha gedirik, ha qaçırıq, uçuruq,

Ayın, Marsın qapısını açırıq.
Kainatın nəhayəti bilinmir,
Nə əvvəli, nə axırı görünmür.
Amma şair könlümə yol bir addım,
Könlümdəki iqlimə yol bir addım.

Anam məni bu həyata gətirdi,
Anam məni xəlq elədi, yaratdı.
Bir gün onu həmişəlik itirdim,
İblis ölüm gözlərinə kül atdı.
O həm mənə ata idi, həm ana.
Həm də mənə arxa idi, dayaqdı
Gündən-günə yüyürürəm yanına,
O heç mənə yaxın gəlmir bir addım.
Məzarından ayağa qalx bir anlıq,
Oğlun gəlib yoxmu bundan xəbərin.
Aramızda ölüm, zülmət qaranlıq,
Necə aşım bu keçilməz çəpəri.
Bu dağları ortalığa kim atdı?
Qovuşmağa qoymur bizi bir addım.

Bu sahildən o sahilə bir addım,
Əsrlərlə durur həmin bir addım.
Bir gün yadlar bu torpağa girdilər,
Başlandı bir hərc-mərclik, cinayət.
Bizi o vaxt şaqqalayıb böldülər,
Bizi böldü iki yerə xəyanət.
Çox millətlər vüsalına yol açdı,
Tapılmadı bir mərd aça bu yolu.
Əsrlərlə ha vuruşduq, çalışdıq,
Qət etmədik bapbalaca bu yolu.
Bu sərhəddən o sərhədə bir addım,
Bu həsrətdən o həsrətə bir addım.
Cinayətdən cinayətə bir addım,
Xəyanətdən xəyanətə bir addım.
Çəpər çəkib yerə, göyə bir addım,
Qoymur bizi birləşməyə bir addım.

Budur mənim dərdlərimin ağırı,
Ana yurdum bələndi öz qanına.
Bizim millət can verməzdi yağıya,
Olmasaydı vətən satan canilər.
Yenə girdi aralığa xəyanət.
Dünən o tay, bu gün bu tay talandı,
İndi burda rəvac aldı sathasat.
Satqınlar da elə haman hamandı,
Yəni həmən köhnə tasdı, hamamdı.
Eh, bizim də günahımız çox idi,
Gərək geri durmayaydıq bir addım.
Buna əsla hüququmuz yox idi,
Gör ki, hələ nəyə taydı bir addım...
Bir addımdan milyon addım yarandı,
Qəddimizi qırıb, əydi bir addım,
Gör nə boyda cənnətimiz talandı,
Görün indi nə deməkdi bir addım...
Bəli, təzə faciəmdir Qarabağ,
Amma satqın canilərim köhnədir.
Bu dərd mənim ürəyimi qanadar,
Bu dərd mənim varlığımı göynədər.
Zəmanədən zəmanəyə bir addım,
Viranədən viranəyə bir addım,
Bu canidən o caniyə bir addım,
Gülüstandan Xocalıya bir addım.

Çoxdan köhnə xatirələr acıyam,
İllər qara saçlarımı ağartdı.
Dünən gəncdim, bu gün isə qocayam,
Gənclikdən yol qocalığa bir addım.
Şair oldum, şairliyi seçmədim,
Öz sözümlə öz dünyamı yaratdım.
Ta az qalıb yır-yığışa, köçməyə,
Burdan ora nə yol var ki, bir addım.
Ordan isə dönməyə nə güman var,
Bir də ordan kim döndü, kim qayıtdı?!
Ordan bura milyon illik zaman var,

Nə olsun ki, arada yol bir addım?!
Bu obadan o obaya bir addım,
Bu nəvədən o babaya bir addım,
Bu alovdan o kösöyə bir addım,
O köhnədən bu təzəyə bir addım,
Yol qalmayıb ta geriyə bir addım,
Bəxt, gəlsənə irəliyə bir addım,
Tale gülsün üzümüzə bir addım,
Bəlkə dönək özümüzə bir addım.

## GÖRMƏYİRSƏN DAĞLAR NECƏ AĞLAYIR...

*Bahar günlərində dostum Əbülhəsən, sehrkar qarmonçu Avtandil, Xızı mahalının onlarla bərbad olmuş qədim yurd yerlərindən biri Xanəgah kəndini ziyarətə getdik... Gördüklərimiz uçuq evlər idi, gözəl bahar idi, ulu günəş idi, bir də bu yerləri qoyub gedən babaların nəticələri – biz idik, bir də bizimlə həsrətimiz, xəcalətimiz idi. Avtandil hündür bir çay daşı tapıb üstündə oturdu, üzünü xərabəliklərə tutub qarmonunu səsləndirməyə başladı. Ölüm sükunətinə qərq olmuş bu aləm elə bil birdən-birə cana gəldi. Elə bil əfsanələr içinə düşdüm. Axı uzun-uzadı dövrlərdən sonra ilk dəfə burada qarmon səslənirdi. Özü də səslənən adi qarmon deyil, Avtandilin qarmonu idi. Bu heyrətamiz duyğular içində mən də bu sətirləri öz içimdə oxumağa başladım:*

Yenə gördüm bu xərabə yerləri,
Yenə mənim şair könlüm talandı,
Çal, qarmonun nalə çəksin dilləri,
Çal, Avtandil, çal qardaşım, amandır...
Çal, həsrətin bəlkə gözü ovula,
Bu qəflətdən yurd yerləri oyana...
İblis sükut bəlkə burdan qovula,
Çal qardaşım, hay verirəm hayına...
Görməyirsən dağlar necə ağlayır,
Uşaq kimi kövrəlirlər məzarlar...
Bu yolları kimlər belə bağladı,
Bu torpağı kimlər saldı nəzərdən?..

“Vağzalı” çal, əlli ildir, yüz ildir,
Bir yol gəlin gəlməyibdir bu kəndə...
Çal, bəlkə də Novruz babam dirildi,
Səda çıxdı bəlkə Xanım nənəmdən...
Çal, tükləri biz-biz durur adamın,
Çal, açıla bəlkə bağlı qapılar...
Çal, bəlkə də cavan ölmüş atamın,
İtib-batmış məzar yeri tapıla?..
Harda qaldı bu yerlərin ərləri,
Necə oldu bu kəndləri salanlar?
Çal, Avtandil, qəlbim qübar eyləyir.
Ovunuram qarmonunu çalanda...
Çal, yerin də qulağı var, qulağı,
O da bizi eşidəcək axırda...
Əcdadların ruhu qalxıb ayağa,
Sanki bizə küskün-küskün baxırlar...
Xəcalətik soyumuzun yanında,
Tək qoymuşuq bu yerlərdə onları...
Babaların qanı axır qanında,
Görmürsən ki, necə çəkir qan qanı?
Görmürsən ki, məzarıstan qaynayır,
Qəbirlərin bizə baxır gözləri?..
Xərabələr yallı gedir, oynayır,
Göyə qalxır nalələri, tozları...
Görmürsən ki, kövrəlibdir sal qaya,
Həsrətindən nə iz qalıb, nə əsər...
Sən o qara qarğaya bax, qarğaya,
Necə durub qulaq asır bu səsə?..
İtib-batmış cığırlar da dirildi,
Bulaqlar da birdən qalxdı lap zilə...
Canavarlar yuvasına giribdir,
Tülkülüyün unudublar tülkülər...
Çal, qardaşım, bir də, bir də çal onu,
Elə bil ki, möcüzə var dilində...
Mənim şeirim, sənin də ki, qarmonun,
Bəlkə ölmüş bu yerləri diriltdə...

## HƏRB BİTƏCƏK...

Vaxt keçəcək, dövr edəcək,
Qan-qadalı hərb bitəcək,
Yağıları qovacağıq
          bu torpaqdan,
Mütləq geri alınacaq
          Şuşa, Ağdam,
Mütləq geri alacağıq
          Kəlbəcəri,
          Laçını da,
Qarabağa bütün yollar
          açılacaq.
Çəkiləcək ulu İsa bulağından
          bulud, duman,
Hərb bitəcək, ağrıları
          göynədəcək
          zaman-zaman...
Hamımızı incidəcək, izləyəcək...
Övladları həlak olan
          analarsa bu dəhşətə
          dözməyəcək,
Daim elə olacaqlar
          yalqız, ağlar,
Elə oğul deyə-deyə
          gözlərini
          yumacaqlar...
Hərb bitəcək... amma onun
          üstümüzdən
          getməyəcək
          kölgələri...
Görən necə böyüyəcək illər ilə,
Məmləkətin yüzlər ilə, minlər ilə,
          yetim-yetim
          körpələri?..
Hərb bitəcək... bunu təkcə
          Allah bilər,

Neyləyəcək sevdiyini
qurban verən
sevgililər?..
Qəlblərində həsrət, qübar,
Nə vaxtacan qara geyib ağlayacaq
nişanlılar?..
Hamısı da nakam-nakam qocalacaq,
qarıyacaq...
Hərb bitəcək... çox-çox qanlı
yaraları
sarıyacaq...
Tənzif, dərman götürəcək
zaman özü...
Hərb bitəcək... ağrıları
odlayacaq
sinəmizi...
Hərb bitəcək... amma heç vaxt
şəhidlərin göynəkləri
kəsməyəcək...
O məzarlar hər gün bizi intiqama
səsləyəcək,
Onlar bizi and verəcək bir
Allaha,
Aldanmasın millət daha...
Aldanmasın baxa-baxa, görə-görə,
Nə daxili, nə xarici
düşmənlərə...
Yetər bu xalq, çox inanıb,
çox aldanıb,
Hərb bitəcək... amma onun
bitməyəcək
sualları...

Vaxt keçəcək, dövr ötəcək...
Qan-qadalı hərb bitəcək...
İnamım var bizim böyük qələbənin
gəlişinə...

Onda necə çıxacaqlar
çox xainlər
el içinə?..
Soruşuram dönə-dönə, təkrar-təkrar,
Hansı üzlə onlar axı?
Hansı üzlə tıxacaqlar,
Çörəyini bu torpağın?..
Soruşuram dönə-dönə, təkrar-təkrar,
Eşidirəm ürəyimin qərarını...
Hansı üzlə qayıdacaq
öz kəndinə,
Öz kəndini qoyub qaçan
fərarilər...
Soruşuram təkrar-təkrar, dönə-dönə,
Nə hüquqla, hansı üzlə,
Yenə vətən deyəcəklər
bu vətənə,
Vətən satan vətənsizlər?..
Soruşuram dönə-dönə, təkrar-təkrar,
Hansı üzlə üzümüzə baxacaqlar,
suyumuzdan içəcəklər,
qapımızdan keçəcəklər?!
Millətin dar məqamında
Oturub öz dükanında,
Oğurluq saqqız satanlar,
Fındıq, püstə, qoz satanlar.
Bığıburma dələduzlar,
alverçilər,
Mən onları bizim soydan
saymayıram
bundan belə...

Hərb ötəcək... bilməm ancaq,
Hansı qəbrə qoyulacaq,
Xalq acından saralanda,
Topdağıtmaz sarayında,
Hər gün öpüb əndamını,

göz-qaşını,
Öz erməni aşnasını,
Gizli yerdə yağ içində
saxlayanlar...
Amma üzdə millət deyib
ağlayanlar...
Hərb bitəcək, çəkiləcək
ağrıları, qorxuları...
Amma heç vaxt bitməyəcək
sualları, sorğuları.

## AMAN ALLAH, MƏNƏ QİYMƏT VERƏNƏ BAX...

Aman Allah, aman Allah,
Mənə qiymət verənə bax...
Saxla, cəfəng sözlərini
yetər, bəsdir.
Mən bilirəm nəyim yaxşı,
nəyim pisdir...
Düşmənimdir boşboğazlar,
gəvəzələr...
Mən özümə özüm mizan, tərəziyəm...
Mən bilirəm öz yaxşımı, yamanımı,
Tərifimi, nöqsanımı...
Anam haqla bələyibdir bələyimi,
Məhəbbətlə doldurubdur ürəyimi...
Ağlım bir şey kəsən gündən,
Öz-özümü zərrəbindən keçirirəm
günü-gündən...
Çörəyimə bircə dəfə haram tikə qatmamışam...
Bir günaha batmamışam...
Hey qaçmışam xeyirimdən,
Bir yad nəfəs görməzsiniz
şeirimdə...
Əlim heç vaxt batmayıbdır

nahaq qana,
Nə insana, nə heyvana
Bir yamanlıq etməmişəm...
Əyri yola getməmişəm,
Bircə qəlbə dəyməmişəm
beca yerə,
Elə bil ki, peyğəmbərəm...
Aman Allah, aman Allah,
Səhvlərimi görənə bax...
Bəsdir, yetər, kiri, dayan,
Dayan, özüm səhvlərimi sadalayım...
Ən birinci bəlam budur
şair doğub məni anam,
Hər bir şeyə inananam...
İnananam kim nə desə,
Təmiz sözə, murdar sözə...
Daim elə inanmışam,
Yalançılar tərəfindən talanmışam...
Aldadıbdır yadlar məni, dostlar məni,
İynə boyda səmimiyyət ovsunlayıb
dərhal məni...
Dağlar boyda ümid verib mənə
xırda bir yaxşılıq...
Bir xoş niyyət, bir xoş qılıq...
Nanəciblər ürəyimə bəzən yara vursalar da,
Yenə, yenə bir nəciblik
aramışam insanlarda...
Oğrularda bir doğruluq,
Gədələrdə bir ululuq,
Yoxsullarda bir zənginlik,
Qorxaqlarda döyüşkənlik,
Dinsizlərdə dindən nişan,
Məzlumlarda bir ehtişam,
Laqeydlərdə sevgi, nifrət,
Vəhşilərdə mədəniyyət,
Zülmətlərdə şölə, işıq,
Kifirlərdə bir yaraşıq,

Gözəllərdə ağıl, kamal,
Məhəbbətdə bir ideal,
Bir kədərə min-min şərik,
Bir baxışda bəşərilik,
İlahilik hər cür dində,
Əbədilik hər ölümdə,
Bir qətrədə bütöv ümman,
Aramışam, axtarmışam...
Aman Allah, aman Allah,
Mənə qiymət verənə bax,
Mənə qiymət verə bilər zaman, Allah...

## ALLAHA YALVARIŞ...

Allah, insan yolun azıb, tamam gedir əldən Allah,
Qaytar onu bu yaramaz yoldan, Allah...
Öz əliylə qəbir qazır özünə o,
Öz-özünü edib insan özünə ov...
Böyük insan dönüb olub kiçik insan,
İnsan qanı içir insan...
Sənə olum qurban, Allah,
Qaytar onu bu qorxulu yoldan, Allah...
Sən gətirdin hamımızı bu cahana,
Sən həm ata, Sən həm ana,
Sən etmisən xilqət bizi.
Sən qadirsən bu bəd yoldan döndərməyə əlbət bizi...
Səndən ayrı guman yoxdur,
Səndən ayrı heç qüvvəyə inam yoxdur...
Nəyə gərək say-hesabsız sürü, Allah,
Çox-çox ölü diri, Allah?..
Su tükənir, çörək qıtdır, hava çatmır,
Xəstələrə iynə, dərman, dava çatmır,
Qoyma yesin bir-birini bəni-adəm vəhşi olsun,
Qoy az olsun, yaxşı olsun...
Qonşumuzda neçə milyon yırtıcı var bəs deyilmi?..
Elə onlar dünya üçün az deyildir...

Tələs, sonra gec olacaq,
Yoxsa insan quduzlaşıb gic olacaq...
Yoxsa tamam gözlərimə qan gələcək,
Axır zaman gələcək...
Səsini kəs xəbislərin, yamanların,
Ələ bütün insanları...
Hamını qıl körpüsündən keçir, Allah,
Çölə çıxar murdarların için, Allah...

Sənin buna ixtiyarın, iqtidarın çatır, Allah,
Ey hər şeyə qadir, Allah...
Yalvarıram Sənə, Allah,
Yoldan çıxsam hətta susdur məni, Allah...

## QAYITDILAR

Çox irəli yüyürdülər,
Axır ilkə qayıtdılar...
Keçmişləri devirdilər,
Baxıb ilkə qayıtdılar...

Çağırdılar hürriyyəti,
Çağırdılar o gəlmədi,
Yenə dünya düzəlmədi,
Ha milləti oyatdılar...

Dil tökdülər kütlələrə,
Baş tutmadı fitnələri,
Tünük moda mütiləri
Qalın kürkə qayıtdılar...

Küçələrə töküldülər,
Qabardılar çəkildilər,
Çox-çox təzəfikirlilər,
Köhnə fikrə qayıtdılar...

Bir vaxt qaçan ibadətdən,
Din-imandan, şəriətdən,
Peyğəmbəri ziyarətdən,
Cərgə-cərgə qayıtdılar...

Şimal ilə dostlaşanlar,
Cənub ilə pisləşənlər,
Zaman-zaman ruslaşanlar,
İndi türkə qayıtdılar...

Dəyişdilər sözlərini,
İtirdilər izlərini,
Ha dandılar özlərini,
Soya, kökə qayıtdılar...

## VƏTƏN QORUDUN SƏNİNDİR...

Vətən qorudun sənindir,
Qorumadın özgənindir,
Qorumadın, yağınındır,
Qorumadın axırındır...

Vətən qorudun sənindir,
O, bayraq tutan əlindir,
Basılmaz qalan, dağındır,
Qorumadın göz dağındır...

Vətən qorudun sənindir,
Yoxsa gədə-güdənindir,
Yoxsa başsız sürünündür,
Bir ovuc sağ ölünündür...

Vətən qorudun sənindir,
Allahın, peyğəmbərindir,
Anan, qardaşın, balandır,
O, indi talan-talandır...

Vətən qorudun sənindir,
O tay-bu taylı ünündür,
İki ağlayan gözündür,
Dərbəndindir, Təbrizindir...

Vətən qorudun sənindir,
Qorumadın kəfənindir,
Qorumadın qübarındır,
Murdarlanmış məzarındır...

## NƏ BİLƏYDİM...

Nə biləydim, dünya belə dönəcək,
Fələk cövlan edəcəkdir tərsinə?...
Çox şey birdən saralacaq, sönəcək,
İndi keçdim bu dəhşətli dərsi mən...

Azərbaycan hamımıza bir evdir,
Hamımıza süd veribdir min illər...
Nə biləydim, axı necə biləydim,
Vətəni nə icmalara bölürlər?!

Ayırırlar doğmalara, yadlara,
Ayırırlar hər ostanı, oymağı...
Şah İsmayıl eşit, gorun çatlasın,
Min bir yerə parçalanıb torpağın...

Nə biləydim, axı necə biləydim,
Bəlkə bildiklərim nağıldır...
Nə millətsiz vəkilləri görəydim,
Nə də meydan şəbihinə baxaydım...

Vallah bunlar bir oyuna oxşadı,
Kim deyərdi gələr elə zəmanə?..
Pislər birdən dönə bilər yaxşıya,
Yaxşılar da dönə bilər yamana...

Nə biləydim, axı necə biləydim,
Dəyişəcək çoxlarının sifəti...
Gərək onda göz yumaydım, öləydim,
O zamanki bütöv idi millətim...

Gərək onda bir tayfuna dönəydim,
Donduraydım sərhədləri, sədləri,
Nə biləydim, axı necə biləydim,
Bu məmləkət satqınlar da bəsləyir.

Canilər də doğur bəzən analar,
Vətənsizlər çox imiş bu vətəndə...
Bəlkə yad qan yeridiblər qanıma,
Bəlkə neçə bədən var bir bədəndə...

Nə biləydim, axı necə biləydim,
Çox dirilər çevriləcək ölüyə...
Deyirlər ki, sən də gərək girəydin,
Bu oyuna, qoşulaydın sürüyə...

Gərək onda mənliyimi sataydım,
Sındıraydım qələm tutan əlimi.
Yalan qusub min günaha bataydım,
Aldadaydım millətimi, elimi...

Dəyişəydim daxilimi, üzümü,
Neçə cildə, neçə rəngə girəydim...
Şairlər də demə satır özünü,
Nə biləydim, axı necə biləydim...

Nə biləydim dünya birdən dönəcək,
Sular birdən axacaqdır tərsinə....
Hətta sözlər saralacaq, sönəcək,
İndi keçdim bu dəhşətli dərsi mən...

## O, BUNU BƏYƏNMİR, BU, ONU BƏYƏNMİR...

Neçin belə yaranıb bu yazarlar görəsən,
O, bunu bəyənməyir, bu, onu bəyənməyir?!
Bu, ona yağdırır ki, sən beləsən, eləsən,
O biri bu birinin soyunu bəyənməyir.

Biri yaratdığını o dərəcə sevir ki,
Nə yazmışam söyləyir hamı qızıl, zər, inci.
Bir yer var irəlidə birdən onu deyir ki:
– Gərək mən oturaydım mütləq orda birinci.

– O ki tamam köhnədir; təzə söyür köhnəyə,
Bu, onun yastığını, mitilini bəyənmir.
O səhnədən düşən tək, bu cumur tez səhnəyə,
Köhnə də təzəsinin stilini bəyənmir.

Biri deyir: O kimdir, mənəm sözün müridi,
Xudaya, bir-birini paxıllamaq azarı,
İçəridən məhv edib, içəridən çürüdüb,
Zaman-zaman nə qədər isdedadlı yazarı.

O buna rəqib çıxır, bu da onu daşlayır,
Bu da klassiklərin olur sənət ortağı.
Bu biri də deyir ki, hər şey məndən başlayır,
O biri də deyir ki, hər şey məndə qurtarır.

Bu deyir ki, dilimdə bir baxın neçə rəng var,
Ha oxuyub baxırsan, seçmək olmur onları...
Nə qədər acı söz var, nə qədər ki, cəfəng var.
Bu, ona ünvanlayır, o, buna ünvanlayır...

O, bunun ayağını qazıyır gündə-gündə,
Bu ona tor toxuyur iftira saplarından.
Bu onun nemətini talayır gündə-gündə,
O daima səhv gəzir bunun kitablarında...

O, buna qarmaq atır, bu ona tələ qurur,
O, buna şər yağdırır, bu onu yamanlayır...
Bu da boy verənlərin bir-bir boynunu vurur,
Söz-sənət meydanında yerini sahmanlayır.

Əsrlərlə yazarlar bu cür davalardadı,
Sənətin son hakimi gələcəkdir, gələcək.
Kimin yeri burdadır, kimin yeri gordadır,
Zaman özü hamıya yerini göstərəcək.

## EŞQ, MƏHƏBBƏT YAŞAYIRSA...

Nə zaman ki, rast gəlirəm bir-bir qoşa gəzənlərə,
Bir-biriyçin yerdən çiçək, göydən ulduz üzənlərə,
Sevgi üçün hər cəfaya, hər əzaba dözənlərə
Düşünürəm bu cahanda müqəddəslik yaşar hələ
Eşq, məhəbbət yaşayırsa tükənməyib bəşər hələ.

***

Qoca olsun, cavan olsun, zərrə qədər fərqi yoxdur,
Kim ki, tənha yaşayırsa ruhu yoxdur, qəlbi yoxdur.
Xilqət üçün eşqdən böyük himn yoxdur, şərqi yoxdur,
Kafiri də sevən olsa, açar, gözəlləşər hələ
Eşq, məhəbbət yaşayırsa tükənməyib bəşər hələ.

***

Onun üçün nə millət var, nə qanun var, nə sərhəd var,
Ayaqları sayalıdır, onda xeyir-bərəkət var.
O cahanda hökmransa ədalət var, hürriyyət var,
O yox isə müdrik şəxslər ləyaqətdən düşər hələ,
Eşq, məhəbbət yaşayırsa tükənməyib bəşər hələ.

***

Onun adı çəkiləndə Əsli, Kərəm yada düşür,
Leyli, Məcnun yada düşür, dərd-ələm yada düşür.
Füzuli tək yanar ürək, sirli aləm yada düşür,
Onu məğlub etməyibdir nə bir zülm, nə şər hələ,
Eşq, məhəbbət yaşayırsa tükənməyib bəşər hələ.

***

Onu nə var, nə də zinyət əvəz edir bu dünyada,
Nə bir sərvət, nə bir qüdrət əvəz edir bu dünyada.
Məhəbbəti, tək məhəbbət əvəz edir bu dünyada,
Ondan qeyri-dəyərsizdir min cür ləli-gövhər hələ,
Eşq, məhəbbət yaşayırsa tükənməyib bəşər hələ.

***

Sən ona can vermisənsə, verəcəkdir o sənə can,
Qanımızda, canımızda çağlayır o ölənəcən.
Axırıncı nəfəsəcən, əzrayılı görənəcən,
Bizlər gəldi-gedəriyik o əbədi yaşar hələ,
Eşq, məhəbbət yaşayırsa tükənməyib bəşər hələ.

## MƏHƏBBƏTSİZ NECƏ ÖMÜR EYLƏR İNSANLAR...

Hamı laqeyd olub daş tək hamı biganəyə dönmüş,
Ürəklər bum buz olmuş boş, soyuq bir xanəyə dönmüş,
Məhəbbət, sevgi qeyb olmuş, tamam əfsanəyə dönmüş,
Küdurət indi hakimdir, odur ki, hey axır qanlar.
Xudaya, bəs məhəbbətsiz necə ömür eylər insanlar...

Bəşərçin ondan özgə bir xilas yoxdur, ümid yoxdur,
Onunla bir keçən ömrə ölüm yoxdur, süqut yoxdur.

Onun ölməzliyinə həm dəlil, həm də sübut çoxdur,
Onunla göz açıb xilqət, onunla dövr edir qanlar.
Xudaya, bəs məhəbbətsiz necə ömür eylər insanlar...

Haçan Məcnun ilə Leyli bu eşqin badəsin içdi,
Bu bir əfsanəyə döndü, gəzib dildən-dilə düşdü.
Məhəbbətsiz min il sağ qalsa da məxluq yenə heçdir,
Eh onsuz bir müqəvvadır bütün hürriyi-qılmanlar,
Xudaya, bəs məhəbbətsiz necə ömür eylər insanlar...

Çox adi daşdı-torpaqdı məhəbbətsiz vətən varsa,
Məhəbbətdir bu torpaqda vətənçin bir yatan varsa,
Onun uğrunda öl, can ver, bir azca qeyrətin varsa,
Ölümdən güclüdür Cabir, anacanlar, vətəncanlar,
Xudaya, bəs məhəbbətsiz necə ömür eylər insanlar...

## ON DÖRD İL YOL GƏLƏN, AYAN...

*Bəli, on dörd illik fasilədən, həsrətli gözləmələrdən sonra, ən yeni tibbi soraqların, müayinələrin, müalicələrin nəticəsində abırlı, həyalı, son dərəcə fədakar, dözümlü gəlin qızım Lalənin Allaha min şükür övladı oldu. Adını da Ayan qoydular. Nəinki tibb elmindən o qədər də başı çıxmayan bizlər – yəni əzizlər, qohumlar, yaxınlar, hətta uşağın ana bətninə düşdüyü ilk vaxtlardan başlayaraq ta son ana qədər inkişafına, doğuluşuna nəzarət, diqqət edən, məsul olan bu sahənin nadir mütəxəssisləri həkimlər belə onun dünyaya gəlişini heyrətlə qarşıladılar, körpəni möcüzə adlandırdılar. Mən isə necə fərəh, qürur hissləri keçirdiyimi yalnız şeirlə ifadə edə bildim...*

Sənə on dörd qurban kəsim,
On dörd il yol gələn, Ayan...
Zaman-zaman uzaq gəzib,
Axır bizə gələn, Ayan...
Səni tutmaram bərabər,
Hər doğulan uşaq ilə.
Səni on dörd il sərasər,
Axtarmışıq çıraq ilə...

Dua qalmayıb etməyək,
Ümid qalmayıb hörməyək...
Loğman qalmayıb getməyək,
Pir qalmayıbdı görməyək.
Gözlərimiz yolda qalıb,
Qulağımız səsdə olub.
Nənələr dili dualı,
Həsrətindən xəstə olub...
Babalar üzə vurmayıb,
İçəridən çəkib, Ayan...
Hamının səadət payı,
Mələklər mələyi, Ayan...
Ürəklər ürəyi, Ayan...
Sənə nə söz yazsam azdı,
Təzə parlayan ulduzum,
Möcüzəyə inanmazdım,
Diri möcüzəsən quzum...
On dörd ildən sonra anan,
Bala aldı qucağına.
Sonalar sonası anan,
Bala aldı qucağına...
Atan gec-tez gələr deyib,
Özünü mətin saxladı,
Aylar ilə, illər ilə.
O iki sevən ürəyi,
Körpə əllərin bağladı,
Daha möhkəm tellər ilə...
İki qəlbin hərarətin
        duyan, Ayan...
Məhəbbətdən yoğrulubdur
        mayan, Ayan...
Əvvəl-əvvəl ümidlərdə
        doğulmusan,
Sonra həqiqət olmusan...
Sən həm qızsan, həm oğulsan,
Həm balasan, həm anasan,
Günəş kimi yeganəsən,

Ay timsallı əfsanəsən,
Ay aya oxşayan, Ayan,
Anaya oxşayan, Ayan,
Ataya oxşayan, Ayan,
Bir suyu da babaya,
        oxşayan, Ayan...
Qoy bunu da deyim sənə,
Yada əziz kəslər düşür...
Nakam Səfurə nənənə,
Sənin bu ulu gəlişin,
Yəqin olub, əyan, Ayan...
Bir azca da nənələrə
        oxşayan, Ayan...
Hətta ölən əzizlərə
Fərəh bağışlayan, Ayan...
İncə, zərif tellərinlə,
Dil bilməyən dillərinlə,
O cubbulu ürəyinlə,
O üç kiloluq çəkinlə,
Gül əsgilərinlə, ağınla,
Hıçqırıb, qımışmağınla,
Harayın, hayın ilə sən,
Nəsillərin soy-kökünü
Polad sapla saplayırsan.
Hamımızı sən bu günü,
Bir işığın şöləsinə
        toplayırsan...
Düz on dörd il gündüz-gecə,
Gümanlardan, inamlardan keçə-keçə,
Gör nə boyda yol gəlmisən,
        gülüm, qönçəm,
        Ayan qızım,
Gör nə boyda yol gəlmisən
        layla deyək
        bir az dincəl,
        Ayan, qızım...

## ŞAİRİ XALQI SAXLAYAR

Bir cəfakeş ana kimi,
Şairi xalqı saxlayar.
Ömrünün sonuna kimi,
Şairi xalqı saxlayar.

***

Qeyrət südü verər ona,
Mərd öyüdü verər ona,
İlham odu verər ona,
Şairi xalqı saxlayar.

***

Cövri-cəfasına dözər,
Üstündə titrəyər, əsər,
Anadan, atadan əzəl,
Şairi xalqı saxlayar.

***

Ovxarlı silahı kimi,
Məsləki, məramı kimi,
Dilinin Allahı kimi,
Şairi xalqı saxlayar.

***

Dövran sıxar, əzər onu,
Fitnə-fəsad pusar onu,
Hökmdarlar asar onu,
Şairi xalqı saxlayar...

***

El adından danışmağa
Bircə odur vəkil, ağa,
Şairin kimi var daha
Şairi xalqı saxlayar.

***

Xalq yolunda salın yada,
Çox yazarlar gedib bada.
Hələ öləndən sonra da,
Şairi xalqı saxlayar.

## O, BÜTÜN CANLILARA MÜŞTƏRİDİR...

Gecə-gündüz qıcıyan üstümüzə,
Aziman əzrayılın dişləridir.
Ölüm əhf eyləməyib bircə kəsi,
O bütün canlılara müştəridir...

Zir-zibildən törəyən milçəyə də,
Körpəyə, gəncə, hər ağbirçəyə də,
Yeddi qardaşa, təkə, bircəyə də,
Sonsuza, kara, kora müştəridir...

Sürünənlər, yeriyənlər ona ram,
Göydə cövlan eyləyənlər ona ram,
Ulayanlar, mələyənlər ona ram,
Kəkliyə, leyə, sara müştəridir...

Canlı ilə okeanlar doludur,
Can alan canilər hətta quludur,
Hətta o divlər üçün qorxuludur,
İblisə, cadugərə müştəridir...

Ya şir olsun, ya pələng, ya canavar,
Ona can verməli kim ki, canı var,
Adicə bir böcəyin son anı var,
İlanı hətta çalan müştəridir...

Tülkünü haqqa salar öz toruna,
Kimdə cürət çatar ondan qoruna,
Həm bu dünya, hə o dünya qul ona,
Həm ora, həm də bura müştəridir...

Balaca sərçədə bilməm nə günah,
Qanadı zər kəpənək də solur, ah,
Aparır ya gəda olsun, ya da şah,
Xəbisə, fitnəkara müştəridir...

Heyfi gəlməz ən ulu dahilərə,
Can alan, işvə satan ahulara,
Nəfəsindən hamımız vahimədə,
Pislərə, yaxşılara müştəridir...

Çəkinir ondan hələ şeytan özü,
Əmri ilə yox olur loğman özü,
Analar dəfn eyləyər, doğmaz özü,
Həm də övladlara müştəridir...

Əzrayıl hökmləri ondan alar,
Gündə min yol əlinə qandal alar,
Gözü doymaz nə qədər canlar alar,
Sürüyər qəbrə, gora müştəridir...

Məhv olar dünya əyər olmasa o,
Yer uçar, göy mələyər olmasa o,
İnsan insanı yeyər olmasa o,
Nə gözəl canlar alan müştəridir...

Nə vəzifə, nə də altun tanıyar,
Eyni gözlə hamıya baxmağı var,
Tək odur ərzidə ahəng yaradan,
Gör necə ülvi, halal müştəridir...

## MƏN DƏ XALQIN ŞAİRİYƏM

Fərman ilə olmasa da, qərar ilə olmasa da,
Bölgə ilə, diyar ilə, mahal ilə olmasa da,
Dəstə ilə, sıra ilə, siyahıyla olmasa da,
Mən də xalqın şairiyəm, bu millətin şairiyəm,
Məhəbbətdən ülvi ad yox, məhəbbətin şairiyəm.

***

Davaları başlayarlar, bitirərlər fərman ilə,
Başçıları təyin edib, götürərlər fərman ilə,
Xainləri qətl edərlər, itirərlər fərman ilə,
Fərmanlardan uca duran həqiqətin şairiyəm,
Bir amalın, bir məsləkin, bir sifətin şairiyəm.

***

Şeir oldu əziyyətim, müsibətim, mükafatım,
Bu dünyayla mübarizəm, o dünyayla ədavətim,
Özüm seçdim özümə bu azad "həbsi", "qazamatı".
Hürriyyətim içimdədir, hürriyyətin şairiyəm.
Sözüm haqqın gücündədir, haqqın mətin şairiyəm.

***

Say-hesabsız bir ordudur yenə bizdə yazan, pozan,
Yox çoxunun nə özünə, nə sözünə qulaq asan,
Rəsmi yolla, sərəncamla xalq şairi olmaq asan,
Sərəncamsız, qeyri-rəsmi ülviyyətin şairiyəm,
Mən bu adın, vəzifənin, təyinatın şairiyəm.

***

Budur mənim mübarizəm, döyüş yolum budur ancaq.
Bütöv vətən, bütöv ölkə, bütöv millət, bütöv torpaq,
Bu müqəddəs, ulu sevgim, necə ki, çin olmayacaq,
Əbədilik bu hicranın, bu həsrətin şairiyəm,
Bu harayın, bu nisgilin, bu möhnətin şairiyəm.

***

Ürəklərə girmək olmaz göstərişlə, qərar ilə,
Qərar ilə ürəkləri "fəth eləmək" fərarilik.
Şair doğur bu dünyaya ilham boyda məram ilə,
İlham varım-dövlətimdir, bu dövlətin şairiyəm,
Bu ilahi bəxşəyişin, bu qismətin şairiyəm.

***

Nə ayrı bir planetdən, nə Marsdan, nə Aydanam,
Həm Bakıdan, həm Təbrizdən,
həm Gəncədən, həm Xoydanam.
Sizin ilə bir qandanam, bir kökdənəm, bir soydanam,
Mən nə qərar şairiyəm, nə də arxiv şairiyəm,
Təpədən-dırnağa kimi elin, xalqın şairiyəm.

## YAXŞILIQLA MƏHV EDİRƏM PİSLİKLƏRİ...

Yaxşılıqla məhv edirəm pislikləri,
Yaxşılıqla çox dərdləri sağaldıram.
Mənə durub bir yamanlıq edən kəsin,
Qabağına yüz yaxşılıq çıxardıram.
Çıxardıram o qanmazı qandırmağa,
Xeyirxahlıq işığında mənliyini yandırmağa...
Tuşlayıram yaxşılığı sinəsinə, kürəyinə,
Ovçu kimi tuşlayıram...
Yaxşılığın xeyirxahlıq işığında,
Varlığını göstərməyə başlayıram...
Söyləyirəm şax üzünə,
Nə durmusan, bax özünə...
Bəlkə elə deyirsiniz bu xasiyyət günahımdır,
Yox, yox mənim yaxşılığım ən xilaskar silahımdır.
Ən xeyirxah pisliyimdir,
İlk baxışda düz omayan düzlüyümdür...
Bəlkə elə deyirsiniz, axı belə olmaz balam,

Bəlkə elə deyirsiniz, qorxacağam, liberalam,
Yox, yox mənim yaxşılığım,
Mənim nizəm, mənim oxum,
Raketlərim, bombalarım,
Axı belə yaşamışlar babalarım...
Dünya qəlbli o kişilər,
Yamanlığa yaxşılıq et, söyləmişlər...
Əsillidir, nəsillidir – yaxşılığım,
Qılıncdan da kəsərlidir – yaxşılığım...
Alçaqların qənimidir – yaxşılığım,
Düşmənə də səmimidir – yaxşılığım...
Yer üzündə xeyirxahlıq toxumu tək əsəcəyəm,
Yaxşılıqla pisliklərin mən kökünü kəsəcəyəm...
Yaxşılığım yaxşılara sədaqətim,
Yaxşılığım insanların pisinə də
Mənim insan məhəbbətim,
Mənim insan küdurətim...

## BUNDAN O YANASI...

Bundan o yanası ölümdür daha,
Daha işıqdan çox, zülmət görürəm.
Ümidim az qalır gələn sabaha
Qarşımda keçilməz bir sədd görürəm.

***

Bundan o yanası ölümdür daha,
Bir gözüm bu evdə, biri ordadır.
Mənim əsil yerim bilinmir daha,
Bir ayağım burda, biri gordadır.

***

Bundan o yanası ölümdür daha,
Daha nə yaşasam qazanc, qismətdir.

Gündə yalvarıram adil Allaha,
Abırlı ölmək də bir səadətdir.

***

Bundan o yanası ölümdür daha,
Ölümdən o yana qalmayır heç nə...
Bu keçilməz yolu keçib çox düha,
Mənə də qismətdir bu yolu keçmək.

***

Bundan o yanası ölümdür daha,
Ondan o yanası mənəm hələlik.
Savabım çox olub, yoxsa günahım,
Bunu o dünyada bilə bilərik.

***

Bundan o yanası ölümdür daha,
Ondan o yanası nəvəm, nəticəm.
Lap ol bu dünyanın ümid, pənahı,
Ölümdür son yekun, axır nəticə.

***

Bundan o yanası ölümdür daha,
Ondan o yanası o biri dünya...
Mən fərq görməyirəm azca vallahı,
Eynidir həm ölü, həm diri dünya.

## ƏLAC GƏRƏK, BU MİLLƏTƏ ƏLAC, ƏLAC

Bu millətin böyüyü ac, uşağı ac,
Ceyranı ac, cüyürü ac, ulağı ac.
Balıqları sahillərdən uzaq düşüb,
Zəmisinə sovka dolub, alaq düşüb.
Şairləri dərd əlindən taxta olub,
Bu millətin bəs haçan tox vaxtı olub?!
Varlısının cibi dolu, mürvəti ac,
Kim saxlayır bəs bu boyda milləti ac.
Böyükləri mənsəb acı, rütbə acı,
Kiçikləri saqqız satır, dükan açıb.
Mollaları ehsan yeyib dönür paza,
Alimləri çöpə dönüb yaza-yaza.
Kasıblıqdır yar-yoldaşı, can-ciyəri,
Kəmərini hər gün sıxır rəncibəri.
Fəhlələri söz yeyirlər yağ yerinə,
Ac oğrular darışıblar bağ yerinə.
Bu millətin acı da ac, toxu da ac,
Həyatda ac, qəbirdə ac, yuxuda ac.
Bəs bu boyda sərvətləri hara axır?!
Bu millətin başçıları hara baxır?!
Oğulları neçin belə zavallıdır,
Gələcəyi qorxuludur, suallıdır.
O taydakı qardaşları, bacıları,
Dözür hər cür təhqirlərə, acılara,
Qədim Bakı Təbrizə ac, ulu Gəncə
Dərbəndə ac.
Həm ağa, şah, həm bəndə ac.
Cərrah qardaş, bıçaq götür
qarnını aç.
Falçı bacı sən də onun falını aç,
Görək haçan tox olacaq qarnı onun,
Bəlkə elə qarğıyıbdır Tanrı onu,
Bəlkə elə fələk özü can evini
bərbad edib.

Hadilər millət deyə, çörək deyə
fəryad edib.
Bu millətin sərvəti çox, ruzusu az,
Ölüsü çox, dirisi az...
Çobanı ac, inəyi ac, sürüsü ac,
Torpaqları para-para, oyuq-oyuq.
Vətəni var, vətəndaşlıq qeyrəti yox,
vətəndaşlıq sərvəti yox.
Məscidi ac, türbəsi ac, mehrabı ac,
Allah, özün üzümüzə bir qapı aç...
Cənnət-cənnət yerləri var, iqlimi var,
Belə yerdə ac qalanın ağlımı var?!
Minlər ilə yurd-yuvasız qaçqını ac,
Gör nə sayda vətən-torpaq məcnunu ac...
Otuz milyon o sahildə ruh acıdır,
dil acıdır,
Bu millətin təkcə birlik əlacıdır.
Birləşməsə ac qalacaq ömrü boyu,
Birləşməsə rəzil olub alçalacaq ömrü boyu.

## NƏ QƏDƏR CANIM VAR...

Nə qədər canım var, sağam, mən səni,
Xatirə olmağa qoymayacağam.
Alıb o dünyanın əlindən səni,
Hər gün bu dünyaya qaytaracağam.

Qoymayacağam ki, unudulasan,
Başıma yağsa da alovlar, odlar.
Sən də hamı kimi ölü olasan,
Sən də hamı kimi çıxasan yaddan.

Qoymayacağam ki, sənsiz yaşayım,
Qoymayacağam ki, nə qədər sağam...
Gecə yastığına qoyub başımı,
Ruhunla yan-yana uyuyacağam.

Gündüz şəklin ilə danışacağam,
Bir də sənə oxşar oğullarınla...
Hər gün ölüm ilə vuruşacağam,
Onu boğacağam ağrılarımla...

Qoymayacam ki, olasan sən də,
Bütün ölülər tək cansız, ürəksiz.
Bir toya, mağara, yasa gedəndə,
Yerin boş qalacaq yanımda şəksiz...

O yerə kimsəni qoymayacağam,
Səni mənim üçün kim əvəz eylər?
O yeri mən sənə saxlayacağam,
Sənin boş yerin də mənə bəs eylər.

Nəçidir ürəyin yanında həsrət,
Yoxluq boş xəyaldır sevgi olanda.
İnsanlar ölümlə ölmürlər əsla,
İnsanlar ölürlər unudulanda...

Yox sən unudulsan qoymayacağam,
Təkliyi öldürüb xar edəcəyəm.
Bütün həsrətləri qovlayacağam,
Bütün yoxluqları var edəcəyəm...

Oğlumuzun toyu hey düşür yada,
Kaş oğul nəvəmiz olsun deyərdim.
Sənsə həsrət qaldın qıza dünyada,
Sənsə qız istəyər, qız diləyərdin.

Ta istəklərin sındı qanadı,
O çağlar qayıtmaz dünya dağıla.
Gecəli-gündüzlü yalavarıb indi,
Deyirəm, kaş bircə qız nəvəm ola.

Ki, sənin adını qoyum o qıza,
Bilim ki, o bala öz nəfəsimdir.

– Səfurə, Səfurə, çağırım o da,
Səsimə səs versin o da bəsimdir...

Yaşamaq çətindir, unutmaq asan,
Nə qədər canım var, nə qədər sağam...
Ölü diriltməyi bacarmasam da,
Mən səni ölməyə qoymayacağam,
Xatirə olmağa qoymayacağam...

## YARI-YARI,
## BÜTÖV-BÜTÖV...

Çox şeyimiz bütöv deyil,
Çox şeyimiz yarı-yarı...
Yarı şərik, yarı xeyir,
Sevməyimiz yarı-yarı...
Yarı ürək, yarı başıq,
Tamam yarı vətəndaşıq,
Yarı güllə atanlarıq,
Yarı haqqı tutanlarıq.
Yarı qorxaq, yarı igid,
Yarı imam, yarı yezid,
Yarı nəcib, yarı kinli,
Yarı şiə, yarı sünnü,
Vicdanımız yarı-yarı,
İmanımız yarı-yarı...
Yarı ağa, yarı kölə,
Yarı ağlar, yarı gülər,
Yarı bizli, yar sizli,
Yarı gözsüz, yarı gözlü,
Yoxumuz, bəlimiz yarı,
Səxavət əlimiz yarı...
Yarı ondan, yarı bundan,
Yarıyacan bəni-insan,
Nağıllarda olduğu tək,
Yarı balıq, yarı mələk...

Hüsnü-camalımız yarı,
Ağıl-kamalımız yarı..
Yarı qurduq, yarı sürü,
Yarı sağıq, yarı ölü...
Suyumuz, dənimiz yarı,
Hətta vətənimiz yarı...
Amma süstlüyümüz bütöv,
Nadürüstlüyümüz bütöv,
Milli korluğumuz bütöv,
Rüşvətxorluğumuz bütöv...
Rütbə savaşımız bütöv,
Əlimiz, başımız bütöv...
Burun-qulağımız bütöv,
İtmiş papağımız bütöv,
Çərənçiliyimiz bütöv,
Mənəmçiliyimiz bütöv,
Yuxu yastığımız bütöv,
Qohumbazlığımız bütöv,
Bölmək ənənəmiz bütöv,
Yerliçi genimiz bütöv,
Bu dərd-mərəzimiz bütöv,
Tayfa-ərazimiz bütöv,
Bizə özün çarə elə,
Xilas elə Tanrı bizi...
Tamımızı yarı elə,
Tama çatdır yarımızı...

## BU XALQA LAYİQ OLSUN
## BU XALQDAN DANIŞANLAR

Birliyə gəlməyirlər birlikdən danışanlar,
Yüz kökə ayrılırlar bir kökdən danışanlar.

***

Dinsizlər, imansızlar din-imandan danışır,
Qorxaqlar səhər-axşam Koroğludan danışır.

Yaddaş törəmələrsə milli qandan danışır,
Böhtana qurşanıblar düzlükdən danışanlar.
Yadlara nökərdilər bizlikdən danışanlar.

***

Ədalət bağıranlar ədalətdən gendədir,
Allahı çağıranlar göy kağıza bəndədir.
Xalqı geri çəkənlər hamımızdan öndədir,
Donluqsuz qoydu bizi bolluqdan danışanlar,
Hüquqsuz qoydu bizi hüquqdan danışanlar.

***

Nəyimiz var dağılıb, oğurlanıb, talanıb.
Bir dəvəyə yük olar elin olan-qalanı.
Söz ilə doyurdular fağır-füqəranı,
Sözü yemək olmayır hərzə, boş danışanlar,
Başımızı apardı, yordu çaş danışanlar.

***

Vicdan deyir, bir gilə vicdanı olmayanlar,
Şair olur pul ilə ilhamı olmayanlar.
İnam deyir heç nəyə inamı olmayanlar,
Haram içində üzür halaldan danışanlar,
Məslək alveri edir amaldan danışanlar.

***

Zaman-zaman bu yurdu neçə yerə böldülər,
Mahallara böldülər, bölgələrə böldülər.
Balaca bir ölkəni ölkələrə böldülər,
İndi bu tayı satır, o taydan danışanlar,
Bizi az sayda qoydu çox saydan danışanlar.

***

Türkmənçayda cənubu əta etdik yadlara,
Doğma qardaş-qardaşdan uzaqlaşdı, yadlaşdı.

O dövrdən nə qədər aylar-illər adlayıb,
İndi Şuşanı verdi Təbrizdən danışanlar,
Nə versən yeyir, udur pəhrizdən danışanlar...

***

Bir ölkə ac-yalavac, bir dəstə keyf içində,
Bizə eyib tuturlar özləri eyib içində.
Pulları yad ölkədə, yüz polad seyf içində,
Dar gündə qorxdu, çaşdı qeyrətdən danışanlar,
Milləti qoydu, qaçdı millətdən danışanlar.

***

Çağırıram sağları, səsləyirəm ölüləri,
Necə kəsək siz deyin, bu riyakar dilləri.
Xilas edək bir yolluq bu bəladan milləti,
Ki, haqq yoluna gəlsin nahaqdan danışanlar,
Bu xalqa layiq olsun bu xalqdan danışanlar.

## ŞEİR YAZMAYANLARI GÖRÜB, VƏCDƏYƏ GƏLDİM...

Şeir ilə yaşadım həftələri, ayları,
Qələmimi yormadı sözün sərt dolayları.
Məni ilham səslədi, çağırdı, harayladı,
Onun havası ilə sözə səcdəyə gəldim.
Bu meydanda mən də öz kəhərimi səyritdim,
Şeir yazmayanları görüb, vəcdəyə gəldim.
Şeir yazanlar məni çiyrindirdi şeirdən...

Mən onlarda Sabirdən heç nişanə görmədim,
Azca əsər görmədim Nəsimidən, Hadidən.
Gözlərində eşqdən bir işarə görmədim,
Paxıllıqdı çoxunun işi, gücü, adəti...

Bu aləmə mən Müşfiq, mən Vurğun deyə gəldim,
Həm də haqqın verdiyi ilham adlı sehrlə...
Şeir yazmayanları görüb, vəcdəyə gəldim.
Şeir yazanlar məni çiyrindirdi şeirdən...

Mən onlara baxanda qəlbim düşdü təşvişə...
Dedim, bəlkə keçibdir sözün vaxtı, əyyamı...
Sənətkarlar gözümdə Allah olub həmişə,
Yenə Allah sayıram Şəhriyarı, Xəyyamı...
Əlim qələm tutalı bu fikrə, rəyə gəldim...
Bu inam mənimlədir o vaxtdan, o dövrdən...
Şeir yazmayanları görüb, vəcdəyə gəldim.
Şeir yazanlar məni çiyrindirdi şeirdən...

Aşıq Cuma düz deyib, düz yazıb Molla Cuma,
Əsil dost, şair də, ya bir olar, ya iki...
Bizdə nəzm qoşanlar xalqa keçib hücuma,
Beş deyil, on beş deyil, bir ordudur bizimki...
Qoy Xaqani, Natəvan gəlsin, köməyə gəlsin,
Qoymayın bu naşılar söz mülkünü devirdi...
Şeir yazmayanları görüb, vəcdəyə gəldim.
Şeir yazanlar məni çiyrindirdi şeirdən...

Yazanlar, and verirəm şairlərin canına,
Qələmləri tullayın, varaqları tapdayın...
Gedəyin söz loğmanı Nizaminin yanına,
Bu müşkülə, bu dərdə bəlkə əlac tapdı o...

Füzuli də İraqdan qədim Gəncəyə gəlsin...
O da nəhəng, möhtəşəm, o da pirdi şeirdə...
Şeir yazmayanları görüb, vəcdəyə gəldim.
Şeir yazanlar məni çiyrindirdi şeirdən...

## HƏMİŞƏ ƏLİ QILINCLI TƏMİZLİYİMİ QORUDUM...

Həmişə əli qılınclı təmizliyimi qorudum,
Bu həyatda ən birinci təmizliyimi qorudum...

Bu döyüşdə gəlib keçdi hər bir ayım, hər bir ilim,
Qorxutmadı əsla məni nə bir hədə, nə bir ölüm.
Balaca bir şər görəndə qaçdım ondan ilim-ilim,
Bu həyatda ən birinci təmizliyimi qorudum,
Həmişə əli qılınclı təmizliyimi qorudum.

Bütün aləm riyakarlıq girdabında dağılarkən,
Körpə, məsum günahsızlar haram üstə doğularkən,
Bilə-bilə çoxu girib çirkablarda boğularkən,
Natəmizləri görüncə təmizliyimi qorudum,
Həmişə əli qılınclı təmizliyimi qorudum...

Mən bəslədim daim onu ana uşaq bəslər kimi,
Vicdan kimi, namus kimi, məslək kimi,
Sərvaxt durdum keşiyində bir müsəlləh əsgər kimi,
Ən əziz balamdan öncə təmizliyimi qorudum,
Həmişə əli qılınclı təmizliyimi qorudum...

Bu batində gedən işdir, amma yaman çətin işdir,
Bu ölməkdən, yaşamaqdan, doğulmaqdan çətin işdir,
Hətta vətən, hətta torpaq qorumaqdan çətin işdir,
Bunu dərk edib duyunca təmizliyimi qorudum
Həmişə əli qılınclı təmizliyimi qorudum...

Saf qaldı ürəyim, evim, şeirim, sözüm, hissim,
Bütün hiylələrə dözdüm, bütün həmlələrə dözdüm,
Murdarlıq girişdi mənə başını bədəndən üzdüm,
Ondan kam aldım doyunca, təmizliyimi qorudum,
Həmişə əli qılınclı təmizliyimi qorudum...

Qanımı min yol tökələr, ayrılsa ətim ətimdən,
Məkri yaxın qoymaram nə qədər can var bədəndə,
Deyirəm gözümü yumub bir gün dünyadan gedəndə,
Desinlər, Cabir ölüncə təmizliyini qorudu,
Həmişə əli qılınclı təmizliyini qorudu...

## ALLAHIM, BƏLKƏ SƏN DEYƏSƏN

Sanki yer adamı deyiləm,
Olsa da, o mənim yurd, yuvam...
Olmaya bəlkə də deyirəm,
Gəlmişəm bir ayrı dünyadan...
Yüz rəngə girirlər özgələr,
Mən buna uyuşa bilmirəm...
Çoxu tək cildimi göz görə,
Nə edim dəyişə bilmirəm...
Bircə mərdanəlik qanıram,
Bir də ki, borcluyam Tanrıya...
Nə qulluq, nə altun tanıram,
Nə fitnə, nə biclik, nə riya...
Nə əyri əməllə işim var,
Nə də bəd niyyətlə tanışam...
Az deyil altmış yaşım var,
Bir böcək də basdamamışam...
Qəddarlıq gəlməyir əlimdən,
Əməlim işimdən bilinir...
Bir yalan söz çıxa dilimdən,
O günü kəsərəm dilimi...
Haqqa lap min kərə əyilləm...
Haqq ilə ölçürəm hər işi...
Sanki, yer adamı deyiləm,
Ayrı planetdən gəlmişəm...
Milyonla insanın içində,
Az qala ürəyim çatlayır...

Bu boyda cahanın içində,
Vaxt olur heç havam çatmayır...
O qədər boldur ki, satqın, xam,
Hansından özümü qoruyum?..
Sahilə atılmış balığam,
Düşmüşəm nadanlıq toruna...
Qaçıram qurtula bilmirəm,
Dururam yetməyir dözümüm...
Hamı tək mən ola bilmirəm,
Qəsd edə bilmirəm özümə...
Adamlar qızıla qul-kölə,
Adamlar vəzifə dəlisi...
Alınır, satılır pul ilə,
Xilqətin minlərlə pərisi...
Hər şeyi hərraca qoyublar,
Hamının məsləki cibində...
Düzlərin dərisin soyurlar,
Başların kəsirlər dibindən...
Yaxşılar tez gedir dünyadan,
Əlləri hər şeydən üzülü...
Düzəlməz bu aləm heç zaman,
Düzəlməz, çürükdür özülü...
Min kərə bulanıb qapıda,
Qan ilə bələyi bələnib.
Vəhşilik minibdir qanuna,
Vəhşilər bəşəri talayır...
Enmişəm göylərdən bəlkə də,
Bəlkə də dəryadan gəlmişəm...
Allahım, bəlkə sən deyəsən,
Deyəsən, mən hardan gəlmişəm?..
Bilirəm çoxuna indi mən,
Gülməli gəlirəm, gülməli...
Əsil insan görmək istəsən,
Necə ki, sağam gəl, gör, məni...

## YAXŞI OLMAĞIN ÖZÜ
## DEMƏ GÜNAHMIŞ...

Mənə günah tutdular insanlığımı,
Dedilər, çox həlimsən, çox humanistsən...
“Üzümə oxudular nöqsanlarımı”
Mən də cavab verdim ki: – razıyam sizdən...

Doğru söz deyirsiniz, alqış doğruya,
Sizə təşəkkür edim necə bilmirəm...
Ya yaxşı, ya yamanmı, neyləyim, buyam,
Əsla təbiətimdən qaça bilmirəm...

Sözüm qəribə gəldi nəsə onlara,
Mən öz nəcibliyimin gülüncü oldum...
Dedilər: – rütbə hara, nəciblik hara?
Gərək rütbədə oldun, qılıncın olsun...

Gərək əzazil ola başçı olan kəs,
İndi bir ayrı vaxtdır, bir ayrı gündür.
Don Kixotluq bir qara qəpiyə dəyməz,
Xeyirxahlar baltayla baş kəsir indi...

Vəzifə tuta bilməz mülayim insan,
Sən insansan amma ki, rəhbər deyilsən...
Sən hətta pisləri də bəzən bağışlayırsan,
Heç kəsə güldən ağır söz deməyirsən...

Niyə işdən qovmursan bu tənbəlləri,
Əlində nə qədər fakt, nə qədər əsas...
Sən bizim kollektivə gələndən bəri,
Hələ bircə nəfər də almayıb cəza...

Biri kinayə ilə acıdı mənə,
Dedi:– sənə yazığım gəlir vallahı,
Bir iblis də dişini qıcıdı mənə;
– Bağışla, bu humanizm olmadı daha...

– Xasiyyətim belədir, neyləyim– dedim,
Bu da yəqin Xudadan mənim cəzamdır...
Özgəyə pislik etmək mənə çox çətin,
Özümə pislik etmək min yol asandır...

Mənə günah tutdular insanlığımı,
Dedilər, çox həlimsən, çox humanistsən...
"Üzümə oxudular nöqsanlarımı"
Mən də cavab verdim ki; – razıyam sizdən...

Neyləyim anam belə büküb əskimi,
Pislikdə, murdarlıqda yoxdu səriştəm...
Bütün nanəciblərə etiraz kimi,
Axır ərizə verib çıxdım o işdən...

## XALQ

Tac-taxt axtaran kəslər əlində,
Daim hədəfdi, bir nişandı – Xalq...
Yurdun dar günündə, ağır ilində,
Çarpışan da xalqdır, əlləşən də – Xalq...

Düşmən qarşısında o sədə dönər,
Vicdana, namusa, qeyrətə dönər.
Əlüstü sayılar, hörmətə minər,
Bir savaş düşəndə, qan düşəndə – Xalq...

Yalançı başçılar, vəkillər onu,
İlan tək çox dəmə çəkiblər onu,
Xalqım deyə-deyə söküblər onu,
Aldanan da XALQDIR, xam düşən də – Xalq...

Dövlətlər dəyişib o durur yenə,
O öz kimliyini qoruyur yenə,
Uca ola-ola aşağı yerə,
Layiq olan da XALQ, əyləşən də – XALQ...

Bütün ululuların odur ulusu,
İgid Babəki var, qoç Koroğlusu,
XALQ kimdir, millətin dilsiz yavrusu,
Əl-ayaqsız da XALQ, möhtəşəm də – XALQ...

Nə şöhrət tanıyar, nə ad, nə mənsəb,
Məhv olar o qara kütləyə dönsə,
Pərən-pərən olmuş sürüyə bənzər,
Özüylə çəkişib didişəndə – XALQ...

Nifrəti dərində, eşqi dərində,
Zəhər bir əlində, bal bir əlində,
Mərdlik hifz eləyir qəm-kədərində,
Faciə yaşadır gülüşündə – XALQ...

Ona bu dünyada tay ola bilməz,
Qılıncı olmasa sayıla bilməz,
Önündə bir qüvvə dayana bilməz,
Əl-ələ verəndə, birləşəndə – XALQ...

## SÖZ SATIRAM ALAN YOX...

Çox dəyərlər talan olub, uçulub,
Sökür, yeyir kim nə qədər bacarır...
Şairlərin şöhrətləri uçulur,
Dəllalların kabusları ucalır...

Dahi sözü indi olub gülməli,
Tacir sözü əsir edib çoxunu...
Nəyə gərək Nizaminin heykəli,
Amma boldur satmaq üçün çuqunu...

Baş əyərəm bir təmiz kəs tapılsa,
İndi bizi natəmizlər tanıdır.

Kim bu xalqı daha artıq çapırsa,
O kütlənin şərəfidir, şanıdır...

Zirzəmilər zırpıların səngəri,
Hər nə desən satır orda qor-qoduq...
Atom belə qıra bilməz onları,
Basılmazdır alverçilər ordusu...

Belələri vətən, millət tanımaz...
Onun bircə pul sözü var dilində,
Xirtdəyimiz, nəfəsimiz, canımız,
Kartof, çörək, ət satanın dilində...

Çox kişilər dişi olub qorxudan,
Çox dişilər kişi kimi çarpışır...
Qardaş vurur qardaşını arxadan,
Dönüb olur erməninin qardaşı...

Üzdən hamı millət dərdi çəkəndi,
Bəs nə üçün qanı axdı millətin?..
İtdi, batdı, tərac oldu, tükəndi,
Ta adı var, özü yoxdur millətin...

Öz qarnına yem güdənlər az deyil,
Vətən gərək yerləşməyə gödəndə...
Sözdə vətən göyərdənlər az deyil,
O göyərə gərək qanda, bədəndə...

Hanı igid Koroğlumuz, hardadır,
Nə zamandır eşidilmir nərəsi...
Gəlsin, görsün qeyrət satır, ar satır,
Torpaq satır onun nankor nəvəsi...

Xəbər verin, Vaqifə, Vidadiyə,
Ta onlar tək dost qeydinə qalan yox...
Allah, həsəd aparıram Hadiyə,
Söz satıram, indi onu alan yox...

Meydanlarda qışqırırdıq biz nərik,
Cəbhələrdə itdi, batdı səsimiz...
Çox deyirdik, Qarabağı vermərik,
Yarı olub daha məmləkətimiz...

Bu yarı da yarılara bölünüb,
Yarıcandır yarıların özü də...
Allah, mənə ta yarımçıq görünür,
Azərbaycan kəlməsi də, sözü də...

## BU MİLLƏT...

Nə gündəydi, indi qalıb nə günə,
Gözdən düşüb gözdə olan – bu millət.
Yas günündə toy eləyir özünə,
Toy günündə yasda olur – bu millət...

Vətən yanır heç pozmayır keyfini,
Xidmət edir öz nəfsinə, cibinə,
Düşüb zülmət bir quyunun dibinə,
Zaman-zaman üzdə olan – bu millət...

Başlanıbdır soyqırımı, ölümü,
Nə biləsən bəlkə məhşər günüdür,
Neçə yerə parçalanıb, bölünüb,
Neçə-neçə dəstə olub – bu millət...

Top-tüfəngsiz yada verdi Şuşanı,
Bir hay ilə tən yarısı boşalıb,
Niyə belə laqeyd olub, korlaşıb,
Dönməz olan, həssas olan – bu millət...

Elə bil ki, buxovlanıb əlləri,
Sökür onu beş-on quduz erməni,
Savaşda da asta-asta tərpənir,
Hər bir işdə asta olan – bu millət...

Fərsizləşib fərsizlərin əlində,
Yaraları dərindədir, dərində,
Nə zamandır bu dünyanın əlində,
Nə kədərli dastan olub – bu millət...

Atam oğlu, tulla qara eynəyi,
Bax, gör al-qan içindədir köynəyi,
Düşmən ilə dava-dava oynayır,
Nəslən şiri-aslan olan – bu millət...

## DEYƏ BİLMƏRƏM...

Məni də belə yaratdın, Tanrım,
Dözümlü, kövrək, sakit, sadədil...
Özümdən başqa hamıya yandım,
Yaxşılıq oldu peşəm, adətim...

Bəşər gözümdə bir allah oldu,
Ona baş əydim gündə min kərə...
Hətta pisə də xeyirxah oldum,
Nəciblik etdim nanəciblərə...

Məni də belə yaratdın, Tanrım,
Həssas, dərd duyan, həlim, abırlı...
Hətta dil tapıb bədlə dolandım,
Hətta düşmənə açdım qapımı...

Od verdin mənə, təb verdin mənə,
Nə qədər nəğmə ötdüm həyatda...
Şair nəfəsli qəlb verdin mənə,
Riyakara da inandım hətta...

Haram yemədim ömrüm boyunca,
Süfrəmdə halal çörəyim oldu...
Yaşlandım, saçım ağardı, ancaq,
Ürəyim uşaq ürəyi oldu...

Məni də belə yaratdın, Tanrım,
Heç nədən umu-küsüm olmadı.
Sadə yaşadım, sadə dolandım,
Dünya malında gözüm olmadı...

Çoxu pul yığıb çin-çin düzdülər,
Mən dövlət dedim şeirlərimə...
Sətir çinlədim sətir üstünə,
Qızıl yerinə, altun yerinə...

Məni də belə yaratdın, Tanrım,
Biclik, xəbislik, nədir bilmədim...
Kimə əl tutdum, kimə inandım,
Axırda gördüm qədir bilmədi...

Uca zirvədən baxdım aləmə,
Çox təmiz olmaq özü ağ imiş.
Faciə imiş adamlıq demə,
Düz olmaq demə pis olmaq imiş...

Məni də belə yaratdın, Tanrım,
Belə yaratdın, niyə bilmirəm...
Binadan bu cür yoğruldu xəmrim,
Yaxşıdı, pisdi deyə bilmirəm...

## İŞLİ GÜNLƏRİM, İŞSİZ GÜNLƏRİM...

İşli günlərimin dostları boldu,
Hətta yadların da yadında idim...
Hərə də özünə bir pay umurdu...
Şöhrətin vəzifə atında idim...

Hamı stolumu gəlib sayardı,
Yaltaqlar görərdim gündə bir qoşun,
Amma ki, özümü qərib sayardım,
İçində bu qədər cəfəngin, boşun...

Telefon gecə də ötərdi dil-dil,
Evdə də, işdə də qapardı məni...
Eləsi vardı ki, öləydim qəfil,
Gəlib qəbirdə də tapardı məni...

Cumardı gündə bir məddah üstümə,
Daim ətəyimdə idi əlləri...
Elə şığıyardı yadlar üstümə,
Deyərdin çoxdankı can-ciyərlərik...

İşli günlərimin zəhimi vardı,
Möhürü, maşını, hökmü, hikkəsi.
Xalqımız rütbəyə əyilən xalqdı,
Hamı vəzifəyə kölə, qul, əsir...

Kənardan baxırdım bəzən özümə,
Mən özüm özümdən şəkə düşərdim.
Hər gün ürəyimə, hər gün sözümə,
İşli günlərimdən ləkə düşərdi...

Nə qədər qohumum varmış sən allah,
Bəlkə pünhan-pünhan nəslimiz artıb?..
Gələnlər əlindən qapımı vallah,
Az qala gecə də açıq qoyardım...

İşsiz günlərimin dostları tək-tük,
Amma ki, heyrəti, sehiri bol-bol...
İşsiz günlərimin mənası böyük,
Qiyməti, dəyəri, xeyiri bol-bol...

İşsiz günlərimin qohumu az-az,
Sayını barmaqla sanamaq olur...
Gedənim, gələnim, qəyyumum az-az,
İndi doğmaları tanımaq olur...

Yadlar nə gəlirlər, nə də gedirlər,
Ta qalıb gözləri özgələrində.

İşsiz günlərimdə mənimlədirlər,
İşli günlərimdə az görünənlər...

İşsiz günlərimin telefonu laldır,
İtib ünvanımız, batıb nömrəmiz...
İşsiz günlərimin suyu halaldır,
Çörəyi tər-təmiz, duzu tər-təmiz...

İşsiz günlərimin işdir hər günü,
Açılıb sözümün bağlı dilləri...
İşli günlərimin yuyur çirkini,
Gecəli-gündüzlü işsiz günlərim...

İşsiz günlərimin həmdəmi yanmaq,
Məşələ dönübdür qələm əlimdə...
İşli günlərimə sahibdim, amma,
İşsiz günlərimin qulam əlində...

Onlar qurtardılar ruhumu dardan,
Elə bil açdılar bağlı gözümü...
Özümə baxıram durub kənardan,
Daha tanıyıram özüm özümü...

Bərk-bərk yapışmışam daha qələmdən,
Gecə də, gündüz də işdədir əlim.
İşsiz günlərimdə işsiz idim mən,
İşli günlərimdir işsiz günlərim...

## BƏS MƏN HARA GEDİM, BABAM...

*Qızılgül anam əsil Allah adamı idi. Doxsan dörd yaşında belə məscidə gedər, heç vaxt namazını buraxmazdı. Nəql eləyirdi ki, atası Hüseyn kişi əsrimizin əvvəllərində Kərbəla ziyarətinə gedərmiş. Yola düşən günün sübh çağı yuxudan durub kəndimizin ən görümlü, ən hündür yerində tikilən evimizin qabağına çıxıb üzünü qibləyə döndərib Allaha yalvarmağa başlayıbmış... – Xudaya, – deyirmiş – mənim səfərimi ən əvvəl uğurlu elə... gedim Kərbəla, Şa-*

*hi-Nəcəf arzuma yetişim... Bir də Səndən umacağım odur ki, məni elə oradaca peyğəmbərin hüzurunda o dünyaya yolla... həm behiştlik olum, həm də qayıdıb bu kənddə olan bəzi murdarların bir də sifətlərini görməyim... Anam deyirdi ki, Allah elə bil ki, kişinin səsini eşitdi... həm onun ziyarətini uğurlu elədi, həm də düz İmam Hüseyn türbəsinin qabağında namaz qılarkən onun ruhunu canından uçurtdu. O vaxt kəndimizdə olan bəzi bədniyabətlərlə bir daha üz-üzə gəlmədi... İllər arxasından mən də babamın həmişəyaşar ruhuna üz tutub deyirəm ki, baba, sənin üçün o vaxt pislərin əlindən baş götürüb getməyə Kərbəla, Nəcəf vardı...*

Bəs mən hara gedim, babam,
Ulu babam, qədim babam...
Əziz babam, Hüseyn babam,
Pislərdən gen gəzən babam...
Dünyanın ən ağır dərdi,
Hansı dərddir – insan dərdi?..
Gündə rast gəlmək namərdə,
Çətin dərddi, yaman dərddi...
Murdarlar çox dönük olur,
Bəli, dərdin böyük olub...
Böyük olub, ulu babam,
Yaxşıların qulu, babam...
Qəlp götürmür təbiətin,
Baş əyirəm xislətinə...
Kəndimizdə o vaxt yəqin,
Pislər olub dənə-dənə,
Misqal-misqal, dinar-dinar...
İndi sayı-hesabı yox,
Nə bir qeydə alanı var,
Nə bir dəftər kitabı yox...
Vicdanları çürük, axsaq,
Nə oyunlar çıxarırlar,
Yamanlardır hara baxsan,
Hey artırlar, çoxalırlar...
Veclərinə deyil aləm,
Ev yıxırlar gülə-gülə...
Mən də baxa bilməyirəm
O riyakar sifətlərə...

Dünya mənə necə dardı,
Çağlayır nifrətim, babam...
Sənin gedən yerin vardı,
Bəs mən hara gedim, babam?..
Həyanım ol, yetiş dada,
Məsləhət ver, kömək elə...
Getmək olur Təbrizə ta,
Orda qalmaq olmur hələ...
Ora hələ dərdli yerdir,
Özü doğma, sahibi yad...
Millətimin azdır mərdi,
Qorxaqları boldur heyhat...
Hərəsi də öz hayında,
Bunlar yüzmü, minmi, babam,
Tək-tük imiş pislər onda,
Sürüdülər indi, babam...
Hamı olub dəllal, kələk,
İnsanlığın ağı çıxıb...
Baş götürüb Füzuli tək,
Mən də yoxsa dağa çıxım...
Sən getdiyin yollar ilə,
Ay babam, mən də getmişəm...
Kərbəlaya iki kərə,
Bir yol Məşhədə getmişəm...
O yerlərdə olmaq, babam,
Ta özü də bir şərt deyil,
Nə Kərbəla o Kərbəla,
Nə Məşhəd o Məşhəd deyil...
Məkkəni də korlayıblar,
Döndəriblər su yoluna...
Dinsizləri yollayırlar,
Peyğəmbərin hüzuruna...
Mərddə gərək bir üz olsun,
Bütöv babam, mətin babam...
Bir kəs göstər təmiz olsun,
Bir yer göstər gedim, babam...
Ana gərək, bacı gərək,

Dərdlərimə edə çarə...
Yer olmasa qaçım gərək,
Meşələrə, səhralara...
Mürvət yoxdur insanlarda,
Qiyamətdir, nədir, babam?..
Sənin gedən yerin vardı,
Bəs mən hara gedim, babam,
Bəs mən necə edim, babam?..

## SİYAHI QISA ÇIXIB

Vicdanlar cibə çöküb,
Yeni möcüzə çıxıb...
Təmizlər dibə çöküb,
Murdarlar üzə çıxıb...
Yamanlar öz keyfində,
Yaxşılar pisə çıxıb...
Kimin ki, ürəyində
Nə qurd var üzə çıxıb...
Bir vaxt yalan deyənlər,
Neçə-neçə ağ saqqal,
Sifətdən kosa çıxıb...
Qaçqınlarla qurd, çaqqal,
Bir qış da yaza çıxıb...
Xalq daha doyub cana,
Astarlar üzə çıxıb...
Əvəzində ekrana
Hər cür gəvəzə çıxır...
Dollar yığır karlılar,
Bu dəb də təzə çıxıb,
Atamızın malına,
Yadlar vərəsə çıxır...
Harda qaldı o tayım,
Burda qan dizə çıxıb?..
İndi-indi harayım,
Gedib Təbrizə çıxır...

Hürriyyət üzüqara,
Nəqd ikən nisyə çıxıb...
Çoxları meydanlara
Sən demə səs çıxıb...
Haqqı basdalayıblar,
Altından gürzə çıxıb...
Halalları sayıblar,
Siyahı qısa çıxıb...

## OĞULLAR YAXŞI OĞULDU...

Oğullar yaxşı oğuldu,
Pis zamanaya düşdülər.
Hamısı təmiz doğuldu,
Biclər araya düşdülər...

Bəxt onlara düşmən oldu,
Ümidləri həşəm oldu.
Zərləri sürüşkən oldu,
Əyri xanəyə düşdülər...

Yağı yolu kəsdi yenə,
Ellər qanda üzdü yenə,
Kasıblar uduzdu yenə,
Min bir bəlaya düşdülər...

Çox köpüklər üzə çıxdı,
Çox məsləklər toza çıxdı,
Əyrilər təmizə çıxdı,
Düzlər kələyə düşdülər...

Yuxarılar didişdilər,
El malına girişdilər,
Dar məqamda sürüşdülər,
Gedib haraya düşdülər...

## KEÇDİ BİZİM ZAMANAMIZ...

Qürubumuz gəldi bizim,
Keçdi bizim zamanamız...
Dözüm gərək dözüm, dözüm,
Yoxdur ayrı gümanımız...

Unudulur bala-bala,
Çox-çox adlar, çox-çox kəslər...
Allah olur lap az qala,
Dünən gözə görünməzlər...

Qapılmayaq qəmə, dərdə,
Qınamayaq ayı, ili...
Təzələnir əsrlər də,
Nəsillər də təzələnir...

Dahilər də dəbdən düşür,
Zaman heç nə vecə almır...
Ay dəyişir, il dəyişir,
Dəyişməyən bir şey varmı?..

Varsa dostum onda sən de,
De görüm kim əbədidir?..
Bu dünyada təkcə bir şey,
Olum, ölüm əbədidir...

Qürubumuz gəldi bizim,
Keçdi bizim zamanamız...
Dözüm gərək, dözüm, dözüm,
Yoxdur ayrı inamımız...

Dəyişmədə aləm, bəşər,
Dövr edəcək, gün gələcək...
İndi təzə görünənlər,
Dəbdən düşüb köhnələcək...

## YURDUNA AĞLAYAN ANA

Soyuq çadıra sığınıb,
Dizin qucaqlayan, ana...
Unudub şəhid oğlunu,
Vətənə ağlayan, ana...

Bilirəm yadlar əlində,
Əsirdir elin, mahalın...
Deyirsən məni öləndə,
Qəbirstanımıza aparın...

O yerdədir ağrın alım,
Köküm, əqrabam, nəsilim.
Qovun qanlı yağıları,
Məni o yerdə basdırın...

O yerlərsiz mən nəçiyəm,
O yerlərsiz nə qiymətim...
Ölməsəydi bircəciyim,
Çin olardı vəsiyyətim...

El dərdidir, mənim dərdim,
Vətənsizəm, ağrın alım...
Kişim ölüb o yerlərdə,
Gedim qəbrini axtarım...

Tale bizə gör nə yazıb,
Taleyə asısan, ana...
Vətən analar anası,
Ana balasısan, ana...

Hamımız məhkum ölümə,
Vətən sağ olmayan yerdə...
Biz kimə gərəyik kimə,
Bu torpaq olmayan yerdə...

Elə həsrətlə danışdın,
Allahımdın nəzərimdə...
Sən ətəyimdən yapışdın,
Mən əyildim hüzurunda...

Dünyada mənə hələ sən,
Vətənsiz bir insan göstər...
Oğul dərdinə dözənənlər,
Vətən dərdinə dözməzlər...

## ƏZİLDİKCƏ, DANILDIQCA...

Əzildikcə, danıldıqca
çağlayıram tufan kimi,
Tez qələmim baş qaldırır
ilan kimi...
Varlığımda olan bütün
əzalarım dilə gəlir,
Mən şairəm mənimki də
belə gəlib...
Bu hüququ özü mənə
xuda verib,
Əzin məni, danın məni,
ilhamıma qida verin.
Çoxaldıqca ağrılarım,
acılarım,
Buludlardan çıxan səhər
günəş tək açılaram.
Qollarıma qüvvət gəlir
döyüləndə, əziləndə,
Əzilməkdir şairliyin
özü elə əslində...
İncimərəm hətta böhtan
deyənlərdən incimərəm,
Mən onların riya dolu
sözlərindən güclənirəm.

Onlar mənə nifrət verir
mən onlara “minnətdaram”.
Yaxşılardan daha artıq
yamanlara “minnətdaram.”
Rəqiblərim ürəyiniz istədikcə
yıxın, vurun, sökün
məni.
Onda daha möhkəm olur
köküm mənim...
Bu “xeyirxah” işə görə,
“Çox sağ olun” siz ey xəbis “köməkçilər”...
Şeir yazmaq istəyirəm
danılanda, əziləndə,
Əzilməkdir şairliyin
özü elə əsilində...

## QANA QAN...

Millətin beli bükülü,
Hamının gözü kölgəli...
Vətənin qanı tökülüb,
Hamı bu qanda çimməli...

O qan adicə qan deyil,
Nalədir, ağıdır, o qan...
İntiqam, intiqam deyir,
Qisasa çağırır o qan...

Ya dözüb, ya sağ qalıb, ya da,
Ölüb həlak olaq gərək...
Girib, çıxıb bu dəryadan,
Yuyunub pak olaq gərək...

O qan şəhidlərin qanı,
Yanan torpaqların qanı,

Başsız meyitlərin qanı,
Sönən ocaqların qanı...

Sinəmizə dağ çəkilib,
Yad əldədir ana, gəlin...
Qeyrət qanımız tökülüb,
Hamı bu qanda çimməli...

Odur ümid, odur xilas,
Bilir Allah, bilir fələk...
O qan yerdə qala bilməz,
O qana qan alaq gərək...

Bu qurtarar eli dardan,
Haray çəkir vətən qanı.
Öz qanına edib qəltan,
Tökməliyik itin qanın...

Çoxunda insan qanı yox,
Zəhərdi “yan”ların qanı.
Halaldı, gəl, tökəni yox,
O qan soranların qanı...

Bir hüceyrəsi saf deyil,
Cövhəri şər, riya, kələk.
Allah özü savab deyib,
O qanı biz tökək gərək.

Ən sonuncu qətrəyəcən,
Ən sonuncu damlayacan...
Yalnız azca götürəsən,
Tarix üçün saxlayasan...

Haydı, vətən oğulları,
Sən də xalqım, eşit məni...
Öz qanında boğulmalı,
Soyumuzun qan düşməni...

Bir hüceyrəsi saf deyil,
Cövhəri şər, riya, kələk.
Allah özü savab deyib,
O qanı biz tökək gərək.

Ən sonuncu qətrəyəcən,
Ən sonuncu damlayacan...
Yalnız azca götürəsən,
Tarix üçün saxlayasan...

## ŞAİRİN OLMUR DİNİ-İMANI MƏGƏR?

Siyasət şairləri dəbə düşüblər,
Bircə misra becərib yetirməyənlər.
Siyasət meydanına tökülüşüblər,
Söz meydanında duruş gətirməyənlər...

Hamı da buqələmun, hamı da dəllal,
Elə xal toplayırlar, maya yığırlar.
Siyasət dəryasına girirlər Allah,
Min yol dibə çökürlər, üzə çıxırlar...

Şeirdən qeyrihər nə desən yazırlar,
Donos, pamflet, qərar, çıxış, məruzə...
Kürsülərdən kütləni küyə basırlar,
Ekrandan özlərini soxurlar gözə...

Qəzetləri zəbt edib qamarlayırlar,
Nə qədər tutqun gözü dumanlayırlar...
Gələn başçını dərhal tumarlayırlar,
Gedən başçını dərhal yamanlayırlar...

Şair gərək şeirini otura yaza,
Bir özgə əqidəsi, yolu olmaya...
İlhamının səsinə o qulaq asa,
O siyasət kölgəsi, qulu olmaya...

Siyasət yedirtdilər illərlə bizə,
Dadı, rəngi nə imiş biz onu gördük...
Siyasət qısır etdi şeirimizi,
Siyasi şairlərin sonunu gördük...

Söz ayaqlara düşdü, söz xırdalandı,
Söz xırdalandıqca da ad aldı onlar,
Sənətin xəlbiriylə xəlbirlənəndə,
Yalançı padşah tək lüt qaldı onlar...

Birdən cücəyə döndü nə qədər iri,
Elə bil uca dağlar təpəyə döndü...
Töküldü sözlərindən zamanın kiri,
Bütün yazdıqları da köpüyə döndü...

Şeirimiz əvvəlki tək bazardır, bazar,
Yenə onda siyasət üfunəti var...
Yenə sözü hərraca qoyub satırlar,
Yenə söz qoşanların çox sifəti var...

Sənətdə at oynadır yenə düşüklər,
Şairin olmur dini-imanı məgər?
Siyasət meydanına tökülüşürlər,
Söz meydanında duruş gətirməyənlər...

## AZƏRBAYCAN DƏRDİ

Bu gün bircə dərdimiz var – Vətən dərdi...
Hamımızı oda yaxar – Vətən dərdi...
Dava gedir torpağımda,
Şəhid olur yurdumuzun yüz-yüz mərdi,
Vətən dərdi qabağında
Əfsanədir çörək dərdi, yemək dərdi, gödən
dərdi...
Bu gün bircə dərdimiz var – Vətən dərdi...
Qarı düşmən dizimizi qatlayıbdır,

Bütün namus-arımızı tapdayıbdır,
Yurdumuzun yarısını bərbad edib,
Əsir qalmış el-obalar fəryad edir...
Anaların ahı tutub yeri-göyü,
Dərd adamı birləşdirir, amma niyə,
Niyə bizi ayrı salıb Vətən dərdi?..
Vətən dərdi olan vaxtı
parçalanmaq çətin dərddi...
Özümüzdən özgə bizə kömək yoxdur,
Birləşməsək, millətimiz demək yoxdur...
Demək onda tayfalarıq, dəstələrik,
Bununçun da yağı bizi üstələyir,
Belimizi qırıb, əyib.
Dərd adamı birləşdirir, amma niyə
Vəlimiz bir yana çəkir,
Əlimiz bir yana çəkir,
Başımız bir yana çəkir,
əlimiz bir yana çəkir,
Dirimiz bir yana çəkir,
ölümüz bir yana çəkir...
Yurdumuzda dava gedir,
Məmləkətin çevirilibdir altı üstə,
Bu ki, milli faciədir,
Bizsə dava-dalaşdayıq rütbə üstə,
stol üstə, altun üstə...
Ən müqəddəs yerlərimiz
çıxıb bu gün əlimizdən,
Bizsə dava-dalaşdayıq
cılız yerlibazlıq üstə...
Qurumlar var, dəstələr var neçə adda,
Hərənin də öz cəbhəsi, əsl cəbhə çıxıb yaddan...
Allah, özün xilas elə, millətimi
belə şərdən...
Kim olsaydı, vallah, çoxdan birləşərdi...
Birləşərdi qanlı-bıçaq olanlar da,
Bir-birindən hətta uzaq olanlar da,
Lap ağlar da, qaralar da birləşərdi,

Birləşməyən yaralar da birləşərdi...
Ola bilməz ana yurdum yad əllərdə
zindan, qəfəs...
Vətən dərdi qabağında qalan dərdlər,
cəfəng, əbəs...
Vətən dərdi – yaman dərddir,
Vətən dərdi qabağında qalan dərdlər
yalan dərddir...
Vətən dərdi qabağında nə ev dərdi,
nə mal dərdi,
nə can dərdi...
Bu gün bircə dərdimiz var –
o da AZƏRBAYCAN
DƏRDİ...

## ANA, QURBAN OLUM DUALARINA...

Ay ana, düşürsən tez-tez yadıma,
Təzədən dönürəm uşaq oluram.
Dizinə baş qoyub bərk-bərk yatıram,
Bütün qayğılardan uzaq oluram.

Görürəm çiynində yenə də çarşab,
O başdan durmusan sübh namazına.
Əlində o ulu, müqəddəs kitab,
Yenə üz tutmusan göylərə, ana.

Məni tapşırırsan Tanrıya bərk-bərk,
Tək bircə balanı, şair oğlunu.
Deyirsən – Xudaya, ona ol kömək,
Xətadan, bəladan gözlə sən onu.

Ana, qurban olum, dualarına,
Tapşır, yaxşı tapşır Allaha məni.
Tapşır, yaxşı tapşır, ana, ay ana,
Yurdum talanmasın bir daha mənim.

Qurtulum ölümdən, dərddən, kədərdən,
Unudum bir yolluq ağrı, acını.
Millətim qurtarsın işgəncələrdən,
Yağıdan alınsın Şuşam, Laçınım.

Keçim Xankəndindən, Kərkicahandan,
Şəhid torpaqları bağrıma basım.
Şərlər qovulsunlar Azərbaycandan,
Bircəciyinin də tumu qalmasın.

Ana, qurban olum dualarına,
Onların sehrini çox görmüşəm mən.
Elə körpəlikdən ana, ay ana,
Onların sehriylə böyümüşəm mən.

Uzaq səfərlərə getdiyim zaman,
Gizlicə cibimə dua qoyardın.
Məni keçirərdin Quran altından,
Sonra min dil ilə ovundurardın.

O dualarında bir sirr vardı,
Məni hər bəladan qurtarardılar.
Məni təyyarələr sağ aparardı,
Salamat yanına qaytarardılar.

Ana, qurban olum dualarına,
Tapşır, yaxşı tapşır Allaha məni.
Tapşır, yaxşı tapşır, ana, ay ana,
Bir kimsə salmasın günaha məni.

Tapşır, hər nanəcib, nadan, heyvərə,
Çirkab atmasınlar mənim üstümə.
Heç dözə bilmirəm böhtana, şərə,
Murdarlıq ruhumu əzir qəstinə.

Heç dözə bilmirəm riya görəndə,
İblis sifətlərə baxa bilmirəm.

Bir yalan çıxmayıb axı dilimdən,
Mən biclik, xəbislik axı bilmirəm.

Bəzən də dünyadan üzülür əlim,
Tarıma çəkilir beynimdə hər sim...
Nə ümidim qalır, nə də təsəllim,
Tapşır, Allah mənə təsəlli versin.

Bu boyda kişiyəm ağır anda da,
Yenə sən çatırsan dadıma, ana.
Mənə dua elə məzarında da
Ana, qurban olum dualarına...

## YARI YOLDA QOYMA MƏNİ...

Bu yol bir ömür yoludur,
Yarı yolda qoyma məni.
Sənsiz qarmı qorxuludur,
Yarı yolda qoyma məni.

Ömrümün kövrək çağıdır,
Saçlarım olub ağımtıl.
Bağıma xəzan yağıbdır,
Yarı yolda qoyma məni...

Sən ruhumsan, ürəyimsən,
Təsəllimsən, köməyimsən,
Ən çox indi gərəyimsən,
Yarı yolda qoyma məni...

Arxada yaz, qabaqda qış,
Tufan, külək, soyuq, yağış,
Əllərimdən möhkəm yapış,
Yarı yolda qoyma məni...

İllər alıb sağ-solumu,
Havamın pisdir durumu,
Sənsiz itirrəm yolumu,
Yarı yolda qoyma məni...

Sənsiz alar üstümü çən,
İtər ayım, günüm, gecəm,
Yolçum ol son mənziləcən,
Yarı yolda qoyma məni...

## ƏL TUTMAQ ƏLİDƏN QALIB...

Ay qapımı döyən yolçu,
Mən də sənin günündəyəm.
Durub boyun əyən yolçu,
Mən də sənin günündəyəm...

Mən də sənin kimi acam,
Amma ki, nədi bilmirəm?..
Sən əl açmaq bacarırsan,
Mən onu edə bilmirəm...

Haldan-hala salır məni,
O bom boş, yalın əllərin.
İlan olub çalır məni,
Mənə uzalı əllərin...

– Boş qaytarma – deyib, Tanrı
Nagah qapına kim gələ...
Əl tutmaq Əlidən qalıb,
Əl tutmaq üçün cib gərək...

Mən də ta ələbaxanam,
Əməlli-başlı, can bacım...

Yarıb qarnımı baxalar,
Qarnın tək boşdu, can bacım...

Gör millət nə günə qalıb,
Olubdu qaçqın, dərbədər...
Üzülüb bəstəkar, alim,
Yazarlar hamıdan betər...

Dəllallar qəbirdən qalxıb,
Lotular bazarı tutub...
Lap az qala bütün xalqı,
Yolçuluq azarı tutub...

Nə böyüyə hörmət edən,
Nə kiçiyə baxan yoxdur.
Bir sürü gədə-güdədən,
Daha bizə aman yoxdur...

Yanında tifil balalar,
Qapımı açdın, can bacım...
Mədəmə rentgen salalar,
Mədən tək boşdu, can bacım...

## BU GÜN ƏSİL DAĞ GÜNÜDÜR...

Bu gün əsil dağ günüdür,
Dağların parlaq günüdür...
Sübh tezdən qalxıb yerindən,
Tutub günəşin telindən,
Şəhərdən qaçmaq günüdür...
Orman darayıb saçını,
Güllər, çiçəklər açılıb,
Baharın şaqraq günüdür...
Göydən yağır nur yağışı,
Dilsiz təbiət danışır,

Dadlı-dadlı, şirin-şirin,
Güneylərin, quzeylərin,
Enişlərin, yoxuşların,
Cəh-cəh vuran quşların,
Keyfinin ən çağ günüdür,
Bu gün əsil dağ günüdür...
Öp yarpaqların üzündən,
Üz lalələr dənizində,
Qara gül də ağ kimidir,
Bu gün əsil dağ günüdür...
Bircə əlçim duman yoxdur,
Bir çobanaldadan yoxdur,
Bir tülkü gözə dəyməyir,
Bir çirkin gözə dəyməyir,
Çağırır sirli meşələr,
Boynu əyri bənövşələr,
Gör necə də şax kimidir,
Bu gün əsil dağ günüdür...
Qaqqıldaşan turaca bax,
Başında qızıl taca bax,
Öz taxtında şah kimidir,
Bu gün əsil dağ günüdür...
Çayların qaçıb yuxusu,
Az qala daşlar oxusun,
Qayalar baş-başa durub,
Güneylərdə dovla qurub,
Kəklik aldatmaq günüdür,
Bu gün əsil dağ günüdür...
Hər nə var gözəl görünür,
Ta deyil dovşanlar qorxaq,
Hətta bayquş, qara qarğa,
Canavar gözəl görünür...
Həzin-həzin axır bulaq,
İç suyundan dadına bax,
Bal kimi, qaymaq kimidir...
Fərəh qəlbdə aşıb-daşır,
Göylər yerə olub aşiq,

Bütün yatanlar oyanıb,
Nəfəslər, canlar oyanıb,
Ölülər də sağ kimidir,
Bu gün əsil dağ günüdür,
Əsil yaşamaq günüdür...

## OLUM-ÖLÜM VAXTI GƏLİB

Vətənimiz, millətimiz ağrı çəkir,
Günlərimiz ağır ötür, ağır keçir...
Varlığımız nisgil dolu, sual dolu,
Hər sualın özündən də sual doğur...
Qəlb dolusu bir sevinən, gülən yoxdur...
Dumandayıq irəlini görən yoxdur...
Ey quşbazlar, bir quş seçin əlasından,
Uça bəlkə bizim Şuşa qalasına...
Lələyinə bir namə də götürsün o,
Dərdimizi Xan qızına yetirsin o...
Qonsun Cıdır meydanına çatan kimi,
Görsün İsa bulağımız yerindəmi?..
Qarabağın göylərində dönə-dönə,
Cövlan etsin hamımızın əvəzinə...
Əli qanlı, dişi qanlı düşmən yəni,
Heç qoyarmı ora bizim göyərçini?..
Heç qoyarmı cəllad ola, Şuşa ola,
Kölgəmizi qılınclayar düşə ora...

Dünənimiz, bu günümüz ağrı çəkir,
Aylarımız ağır ötür, ağır keçir...
Torpağımız, ürəyimiz dəlmə-deşik,
Üzdən sağıq, içdən isə çürümüşük...
Gör nə qədər açılmayan düyün qalır,
Hər cavabın özü belə müəmmalı...
Bir milyondan artığımız dərbədərdir,
Bu millətin ölümünə bərabərdir...

Dörd yanımız düşmən dolu, satqın dolu,
Qeyrətsizlik çox adicə bir hal olub...
Qardaş durub qardaşına güllə atır,
Bu qardaşın qardaşına "pay-sovqatı"...
Başçı ana torpağını pula satır,
Bu başçının öz xalqına "pay-sovqatı"...
Çox-çox cənnət məkanımız əldən gedib,
Nə gedibsə xalqdan gedib, eldən gedib...
Neçə-neçə şəhərimiz talan olub,
Təbriz dərdi, Dərbənd dərdi yalan olub...

İnamımız, imanımız ağrı çəkir,
Həyatımız ağır ötür, ağır keçir...
Hamı alqı-satqı ilə zəhərlənib,
İtirmişik çox mənəvi dəyərləri...
Alver edir uşaq, böyük, cavan qoca,
Başdan-başa bazar olub Azərbaycan...
Almaq olur, satmaq olur hər nə desən,
O əvvəlki məmləkətdən yox bir əsər,
O əvvəlki adamların boş səsi var,
Batini yox, zəhəri var, kölgəsi var...
Hara baxsan, hara getsən dükan-dükan,
İtib nizam, itib zaman, itib məkan,
Təmiz kəslər ac-yalavac, miskin, naçar,
Tale nə vaxt üzlərinə qapı açar?..
Hər görəndə alt-üst olur gümanlarım,
Tursik satan, lifçik satan cavanları...
Yeyən yeyir, çalan çalır, alan alır,
Millətimiz gör nə yaman günə qalıb...
Belə getsə xilasına güman yoxdur,
Özümüzdən özümüzə aman yoxdur...
Ulu xalqım, gəl şairin sözünə bax,
Aç gözünü yaxşı-yaxşı özünə bax,
Yetər, qəflət yuxusundan dur, qalx daha,
Düz sümüyə dirənibdir bıçaq daha,
Qalx, dostunu düşmənindən ayır xalqım,
Olum-ölüm vaxtı gəlib, ayıl, xalqım...

## İSTEFA VERMİŞƏM ŞEİRƏ GÖRƏ

Mən qalan ömrümü həbs eləyirəm,
Onu təkcə şeirə həsr eləyirəm...
Mənəm, dörd divardır, kağız-qələmdir,
Mənə söz qalandır, sənət qalandır.
Gecəli-gündüzlü yazmaqdır peşəm,
Bütün ad-sanlara dal çevirmişəm.
Bütün şöhrətlərə tüpürmüşəm mən,
Yolumun üstündən süpürmüşəm mən,
Bütün ölkələri yıxıb keçmişəm,
Özümə könüllü zindan seçmişəm,
Öz iş otağımı, öz iş yerimi,
Qanımla yazıram sətirlərimi...
Şeirsiz ötüşən günlərim, sizdən,
Bu gün milyon kərə üzr istəyirəm...
Mənəm, dörd divardır, kağız-qələmdir,
Yarımçıq şairlik mənə haramdır...
İstefa vermişəm şeirə görə,
Bütün qulluqlara, vəzifələrə...
İstefa vermişəm şeirə görə,
Bütün məzələrə, əyləncələrə,
Mənəm, dörd divardır, kağız-qələmdir,
Şeirsiz bu dünya puçdur yalandır,
İstefa vermişəm şeirə görə,
Bütün günəşlərə, səyyarələrə...
Bütün qatarlara, təyyarələrə
Dağlara, düzlərə, çəmənliklərə
İstefa vermişəm şeirə görə...
Mənəm, dörd divardır, kağız-qələmdir,
Ümidim, köməyim yalnız qələmdir.
Allah, bircə sənə yalvarıram mən,
Arxa-köməyim ol, yapış əlimdən,
Qəlbləri açmağa açar ver mənə,
Bir də ki, möhlət ver, macal ver mənə...

## DAĞLARIN QUCAĞINDA YATDIM BİR GECƏ...

Dağlar qucağında yatdım bir gecə,
Göylər otağında yatdım bir gecə...
Dünyanın dərdləri çıxdı başımdan,
Unutdum büsbütün qoca sindəyəm,
Yatdım, elə bildim uşaq yaşımdır,
Anamın sehrli nənnisindəyəm...
Şəhərdə ötmüşdü çox-çox illərim,
Gör neçə bahardı, gör neçə qışdı...
Fəqət bu yerlərdən gedəndən bəri,
Belə ləzzət ilə uyumamışdım...
İlbizlər ötürdü elə biaram,
İlbizlər gecənin bülbülləriydi.
Bir vaxt o səslərə uymazdım amma,
İndi mənə necə ləzzət verirdi...
İndi o səslərdə məna duyurdum,
Dup duru olmuşdu fikrim, düşüncəm...
Dağlar mürgüləyir, mən uyuyuram,
Dağlar qucağında keçirdi gecəm...
Hərdən canavarlar ulaşırdılar,
Onlar bu dağlara yaraşırdılar...
Onlara məskəndi bu yer, bu torpaq...
Səsləri zirvələr aşıb gəlirdi...
Bir vaxt o səslərdən qorxardım ancaq,
İndi o səslərdən xoşum gəlirdi...
Mənimlə bir vaxtı düşməndi onlar,
Qəlbimi neçə yol dağlamışdılar...
Keçirib öz qanlı dişinə onlar,
Quzumu sürüdən oğramışdılar...
Deyirdim qurddan da yırtıcısı var,
O zaman çox xiffət, fikir eylədim...
Elə qurd adamlar gördüm sonralar,
Qurdlara min kərə şükür eylədim...
Burda təmiz idi ən vəhşi səslər,

Təmizdi dağların qaranlıq göyü...
Şəhərə qalmışdı qorxulu kəslər,
Quduz maşınların quduz səs-küyü...
Çirkin adamların çirkin işləri,
Nə qədər zalımlar, nə qədər kütlər...
Vəzifə, şan-şöhrət kəşməkəşləri,
Simasız simalar, üzsüz sifətlər...
Şəhərdə qalmışdı, böyük şəhərdə,
Bütün boşboğazlar, bədlər, paxıllar...
Çimdim tər təmiz xatirələrdə,
Bu gecə öz ata-baba dağımda...
Çimirdim, çimirdim, təmizlənirdim,
Qopurdu canımdan illərin kiri qətrə-qətrə...
Açırdım gecəni öz gözlərimdə,
Hopurdu ruhuma səhərin ətri...

## NƏDİR BU MİLLƏTİN GÜNAHI ALLAH...

Göyləri odlayır analar ahı,
Allah da götürməz bu ahı, Allah...
Nə pis işimiz var dərgahındakı?
Nədir bu millətin günahı, Allah?

Kimin toyuğuna daş atıb görən,
Kimin arzusunun əksinə gedib?
Nə yaxşılıq edib özgələrinə,
Nə yamanlıq edib özünə edib...

Heç vaxt yumayıbdır o qanı qanla,
Hətta bağışlayıb düşməni, yadı...
O hətta dil tapıb qonşu ilanla,
Qonşu canavarla yan-yana yatıb...

Nə qədər zərbələr dəyib bu xalqa,
Daim göylərini tutub duman, çən...

Ona gör nə cüzi dost, kömək, arxa,
Ona gör nə qədər düşmən vermisən...

Sən axı ədalət rəmzisən ulu,
Niyə dinməmisən, ey Pərvərdigar?
Gözün baxa-baxa qırıblar onu,
Gözün baxa-baxa parçalayıblar...

Cəza verməmisən günahkarlara,
Onların yurdunu kor qoymamısan...
O qan içənləri çəkdirib dara,
Ya da diri-diri soydurmamısan...

Hər şeyi görənsən sən axı, Allah,
Göstər öz gücünü, ədalətini...
Nədir bu millətin günahı, Allah,
Onun insanlığı qəbahətimi?

Sən özün bu cürə yaratdın onu,
Sadədil, xeyirxah, nəcib, mülayim...
Kim dəyişə bilər xasiyyətini,
Bircə səndən özgə, səndən savayı...

Ona nə vermisən, özün vermisən,
Bir yandan alınmaz dağlar, qalalar,
Bir yandan sən ona dözüm vermisən,
Bir yandan dözülməz dərdlər, bəlalar...

Sən həm Nizamilər vermisən ona,
Peyğəmbər əvəzi, Allah əvəzi...
Həm də ki, canilər vermisən ona,
Doğma qardaşının başını kəsib...

Sən qoç Koroğlular vermisən ona,
Babəklər, Nəbilər, neçə igidlər.
Bir yandan oğrular vermisən ona,
Satqınlar vermisən düşməndən betər...

Qanına bəlkə də yad qan qatılıb,
Bəlkə də kiminsə kələyi varmış...
Bu doğma analı, doğma atalı,
Millətin nə qədər ögeyi varmış...

Sənsən xəlq eyləyən bu göyü, yeri,
Bəşəri sən doğub, əkmisən, Allah...
Yoxsa içimizə şərəfsizləri,
Göydən paraşütlə tökmüsən, Allah...

Sənin ki, ürəyin, axı, dar deyil,
Barı dar məqamda dadımıza çat...
Düşmən gülləsindən ölmək ar deyil,
Ən çox güllləmizdən ölürük heyhat...

Ta sənə qalıbdır son ümid, güman,
Ölürük, batırıq, yanırıq, Allah...
Bizə bu gündə də arxa durmasan,
Daha Allahı da danırıq, Allah...

## AĞILAR...

Nə evdə dözürəm yalqız,
Nə çölə çıxa bilirəm...
Nə də xəcalətdən xalqın,
Üzünə baxa bilirəm...

Başım köksümdə gəzirəm,
Özüm özümü danıram.
Nə düşmən qırıb əzirəm,
Nə şəhid olub yanıram...

Əlim kəsir öz əlimi,
Gör nə nankoram, düşüyəm...
Say-hesabsız qız-gəlini,
Yad əldə qalan kişiyəm...

Sökürlər harınlar məni,
Bütün aləm baxa-baxa...
Güclə aparırlar məni,
Öz-özümü qorumağa...

Ocağı kösövəm,
Alovu, külü ötənəm...
Nə millət kimi bütövəm,
Nə vətən kimi vətənəm...

Ayırın, ətdən ətimi,
Bəlkə bu yurda yarıyam...
Xalqın bu fəlakətinin,
Mən də bir günahkarıyam...

Tez silah verin, götürüm,
Yatan baxtım, oyan görək...
Bu qeyrətsizlik kirini,
Qanım ilə yuyam gərək...

## HAMININ ÜZÜ İÇİNDƏDİR...

Sifətlərə inanmayın,
Hamının üzü içindədir.
Gözlərə çox aldanmayın,
Gözlərin gözü içdədir...

Deyəndə mənə toxunur,
Ki, hər şey gendən oxunur.
Dili çöldədir çoxunun,
Amma ki, sözü içdədir...

Qardaşsa da şərlə xeyir,
Bu onu, o bunu yeyir,
İblis düşmən qorxunc deyil,
Əsil iblisim içdədir...

Daim tənha, təkdir insan,
Şeytandır, fələkdir insan,
Zahirdən mələkdir insan,
Yırtıcı nəfsi içdədir...

İkidir hər şəxsin özü,
Qoy özünə baxsın özü,
Daxildədir əslin üzü,
Yalanı, düzü içdədir...

Nəşəni meydə gəzməyin,
Əlifi beydə gəzməyin,
Allahı göydə gəzməyin,
Allahın özü içdədir...

## EŞQ, MƏHƏBBƏT ÖLMƏYƏCƏK

Xalqlar üz-üzə dursa da,
eşq-məhəbbət ölməyəcək...
Bəşəriyyət qırılsa da,
eşq-məhəbbət ölməyəcək...
Məhəbbəti yerə basdır,
göyərib üzə çıxacaq,
Məhəbbəti məzara qoy,
məzardan səsi çıxacaq,
Poladın içində saxla,
poladı kəsib çıxacaq,
Sevən gözlər kor olsa da,
eşq-məhəbbət ölməyəcək...
Hətta günəş qaralsa da,
eşq-məhəbbət ölməyəcək...
Bütün ərzin yollarını
kərkədanlar kəssə belə,
Qəbilələr bir-birinin
başlarını kəssə belə,

Lap millətlər bir-birini
diri-diri yesə belə,
Ordular üzə dursa da,
eşq-məhəbbət ölməyəcək...
Hər şey tar-mar olsa da,
eşq-məhəbbət ölməyəcək...
Nə Leylinin, nə Məcnunun
kimsəyə kini olmayıb.
Sevənin sevgidən özgə
milləti, dini olmayır.
Qoca ərzin vallah, billah
eşqsiz günü olmayır,
Bu aləm zindan olsa da,
eşq-məhəbbət ölməyəcək...
Hər gün ölüm-qan olsa da,
eşq-məhəbbət ölməyəcək...
İnsan insanı duymasa
ruhu ölər, bağrı çatlar,
Yenə qardaş olacaqlar,
bir-biriylə bütün yadlar.
Məhəbbətdən aşağıdır
ədavətlər, küdurətlər,
And içirəm etiqada
eşq-məhəbbət ölməyəcək...
Sevənə yox zaval, xata,
eşq-məhəbbət ölməyəcək...
Ərzin vulkanları dönə
od dövrünə, köz dövrünə,
Dünya qayıda əvvəlki
su dövrünə, buz dövrünə,
Lap planet qədəm qoya
hətta insansız dövrünə,
Lap meymun əsri gəlsə də,
eşq-məhəbbət ölməyəcək...
Dünya ölüb-dirilsə də
eşq-məhəbbət ölməyəcək...

## GÖRƏCƏKLƏR Kİ, ZÜHUR EYLƏMİŞƏM...

Şeir üçün öz-özümü çoxdan
əsir eyləmişəm...
Balaca iş masamı
qala-qəsr eyləmişəm...
Çəkmişəm duyğuların dağdan
ağır dağ yükünü,
Düşmüşəm misralar ardınca
qərib ahu kimi,
Doğulub qafiyəmin hər biri
bir ağı kimi,
Bu ilahi işə mən ömrümü
həsr eyləmişəm...
Kef-damaq, ya da ki, əyləncə
nədir bilməmişəm,
Dincliyin heç dadı, rəngi
necədir bilməmişəm,
Bəzən heç çöldə ya gündüz,
gecədir, bilməmişəm,
Beytimin abu-havasını
fəsil eyləmişəm...
Könlüm öz yurdumu cövlan
edib seyrə çıxıb,
Xeyri niyyət eyləyəndə
niyyətim xeyrə çıxıb,
Nə zaman ki, yolumun üstünə
bir Leyli çıxıb,
O günü Allaha yüz dəfə
nəzir eyləmişəm...
Yoğrulub ilham ilə ruhum,
hüceyrəm, əzələm,
Şeir Leylim, yeridir adıma
Məcnun desələr,
Toxunanda əlimə cansız, ölü
ya soyuq əl,

Cumub evdə o günü xeyli
qüsl eyləmişəm...
İlhamım lal olan vaxtı
halım olmayıb heç,
Bircə an, bircə dəqiqə
qərarım olmayıb heç,
Qələmimdən savayı özgə
varım olmayıb heç,
Bax onun tişəsin almas,
qızıl eyləmişəm...
Dənilər var yığıblar özünə
mən isə söz.
Qaş-daşım, ləli-briliyantım
olub tər-təzə söz,
Gəlməz heç qiymətə, heç ölçüyə
hər bir təzə söz,
Bax, o sərvət ilə el qəlbinə
yol eyləmişəm...
Beləcə çoxlu on illər
və yüz illər ötəcək,
Qalacaqdır əməlim daima,
canlı, diri tək,
Görəcəklər bu elin şairi,
peyğəmbəri tək,
Təzədən bir də bu dünyaya
zühur eyləmişəm...

## ÖZÜMƏ HEÇ NƏ QALMADI

Hər şeyi xalqıma verdim,
Özümə heç nə qalmadı...
İlləri arxivə verdim,
Özümə heç nə qalmadı...

Aşıb-daşdım sellər ilə,
Qanad açdım yellər ilə,

Yanıb söndüm küllər ilə,
Közümə heç nə qalmadı...

Şeir oldu ömrüm, baxtım,
Söz olub varağa axdım,
Dünyaya qəlbimlə baxdım
Gözümə heç nə qalmadı...

Elin dərdini daşıdım,
Fikir ağartdı başımı,
Ötdüm altmış yaşımı,
Yüzümə heç nə qalmadı...

Xəzan soldurdu gülümü,
Eşitdim ünün ölümün,
Çatdım sonuncu yoluma,
Mənzilə heç nə qalmadı...

## XALQIMA DANIŞARSAN

Təbrizim ömrüm, adım,
Sən məni yaşadırsan...
Mən çoxdan susmalıydım,
Əgərki yaşa dursa...

Sən dadıma çatansan,
Sən əlimdən tutansan,
Sən anamsan, atamsan,
Bacımsan, qardaşımsan...

Biz əl-ələ gəzəndə,
Biz səninlə gəzəndə,
Mən sənə, Təbriz sən də,
Babana yaraşırsan.

Sən mənim özüm, eynim,
Əsil möcüzəm, sehrim,

Mənim körpəlik dövrüm,
Mənim gənclik yaşımsan...

Mən susanda bir günü,
Yaşdarsan ömrümü,
Babanın kimliyini,
Xalqıma danışarsan...

## MİLLƏTİM ALIM QADANI...

Yırtıldı bütün pərdələr,
Hamının üzü açıldı...
Göründü mərdlər, namərdlər,
Qəlblərin pası açıldı...

Bir sürü satqın, avara,
Torpağı qoydu qumara,
Qaldıq naəlac, biçara,
Bünövrə, özül uçuldu...

Hardadır ərlər, ərənlər,
Namusumuz yad əlində,
Şuşanın adı gələndə,
Yaramın gözü açıldı...

Evimə calladlar doldu,
Külüm göylərə sovruldu,
Gülümün yaxşısı soldu,
Tikanın pisi açıldı...

Millətim alım qadanı,
Yetər, dost-düşməni tanı,
Nəhayət töküldü qanın,
Nəhayət gözün açıldı...

# BU ZAMAN BİZİM ZAMAN DEYİL

*Alim dostum A.Ağamusa üçün*

Mənim tale dostum, amal qardaşım,
Vaxtında gəlmədik cahana deyən.
Hamının özüylə qarışıb başı,
Bu zamana bizim zamana deyil...
Yalanlar, riyalar atın səyridir,
Baş açmaq çətindir yüz başın ola,
Tamam elə bil ki, ayrı dövrdən,
Ayrı planetdən gəlmişik bura...
Havasız qalmışıq, ruhsuz qalmışıq,
Don Kixotlar kimi tək olanlarıq,
Biz bu zəmanədə artığıq, artıq,
Biz bu zəmanəyə yük olanlarıq...
Bizimki tutmayır həyatda nəsə,
Elə dövrdəyik hər yan fitnə-şər,
Dəllallar rişxəndlə gülürlər bizə,
Bunlar geri qalıb lağ eyləyirlər...
Şair var dövlətin üzür içində,
Alim var qəssabdan seçə bilmirəm.
Bu qədər nanəcib, müzür içində,
Biz necə yaşayaq, necə bilmirəm?..
Fitnələr qururlar üz görə-görə,
Sonra da yalandan nalə çəkirlər.
Günün günortası göz görə-görə,
Düzü düz dilindən dara çəkirlər...
Kişilər var imiş eh bir zamanlar,
Minib atlarına dağa çıxdılar.
Günbəgün çoxaldı bədlər, yalanlar,
Yaxşılar günbəgün yoxa çıxırlar...
Yeyənlər yeyirlər, alanlar alır,
Hamı da zamana çalanı çalır,
Hamı da zamana adamı olub...
Biz onun adamı ola bilmədik,

Sözlərim bir xəyal, əfsanə deyil...
Zamana çalanı çala bilmədik,
Bu zamana bizim zamana deyil...
Bəlkə ömrümüzü geri dönək biz...
Təzədən qayıdaq dünyaya bəlkə...
Biz nə istəyirdik düzlük, təmizlik,
Halalca yaşamaq, halalca tikə...
Biz nə istəyirdik vicdan paklığı,
Demə boş şey imiş insan paklığı,
Havayı söhbətmiş, söz imiş ancaq...
Mən ki, rast gəlmədim tər tərmiz kəsə,
Adamlar gördüm ki, yüz üzü varmış...
Hamının əmması var imiş nəsə,
Lap ən yaxşının da pis üzü varmış...
Yox, yox ürək dostum, könül sirdaşım,
Bu zamana bizim zamana deyil...
Nanəcib tənəsi, naxələf daşı,
Birinci xeyirxah insana dəyir...
Zəmanə pislərin – zəmanəsidir,
Mənsəbpərəstlərin – zəmanəsidir,
Zəmanə onların zəmanəsidir,
Biqələmunların – zəmanəsidir...
Düzə gülənlərin – zəmanəsidir,
Bizə gülənlərin – zəmanəsidir...
Verib-alanların – zəmanəsidir,
Alim-dəllalların – zəmanəsidir...
Şair-bədxahların – zəmanəsidir...
Pullu-allahların – zəmanəsidir...
Kütləvi şeytanlar – zəmanəsidir,
Mənəvi böhranlar – zəmanəsidir...
Hakim millətlərin – zəmanəsidir,
Saysız sərhədlərin – zəmanəsidir...
Vaxtında gəlmədik dostum cahana,
Eh, daha nə yazım, daha nə deyim...
Lənətə gələsən səni zəmanə,
Bu zəmanə bizim zəmanə deyil...

## GEDƏCƏYƏM SÖZLƏR KİMİ ÇİYİNLƏRDƏ

Mənə sözün ixtiyarın verdi Yaradan,
Dedi: – sənə ilham, qələm qoy kömək olsun.
Məni başa düşmədilər bu zəmanədə,
Axı başa düşmək üçün baş gərək olsun.

Durub dövrə yalvarmadım, üz tutmadım, yox,
Külək hansı səmtə əsdi ora əsmədim...
Şair haqdan yaranıbdır, utanmadım, yox,
Gündə-gündə özümə bir allah gəzmədim...

Öz inamım, öz məsləkim oldu həmişə,
Öz sevincim, öz kədərim, öz qəmim oldu.
Söz şairə əqidədir, yoldur həmişə,
Sözə xain çıxanlara söz qənim olsun...

Anam getdi o anamı eylədi əvəz,
Bacım getdi şeir mənə bir bacı oldu.
O mənimçin könüllü həbs, könüllü qəfəs,
Həm əzabım, həm də əsil əlacım oldu...

Pulsuz oldum, amma ruhsuz yaşamadım mən,
Söz dövlətim, söz ziynətim, söz daşım oldu.
Ölüm ömür yoldaşımı aldı əlimdən,
Poeziya mənə ömür yoldaşı oldu...

Zalım, nankor zəmanənin yaxşısı, pisi,
Aşkar hopdu, çökdü mənim sətirlərimə.
Elə bil ki, vəcdə gəlib Tanrının özü,
Öz əlini çəkdi mənim sətirlərimə...

Əsla bitib, tükənmədi söz əmanətim,
Yollarıma gecə-gündüz o tutdu məşəl.
Amma məni duymadılar bu zamanədə,
Yəqin ayrı zəmanədə başa düşərlər...

Ürəklərə toxum səpdim vermədi səmər,
Ha çağırdım yatan kütlə sanma ayıldı...
Söz sayıldı vecsiz, cəfəng sərsəmləmələr,
Köhnə, cındır ibarələr şeir sayıldı...

Nə qədər ki, ruh yaşayır, can var bədəndə,
Dəyişməzdir şeirim, fikrim, əqidəm, səsim...
İstəmirəm bu dünyadan bir gün köçəndə,
Qara kütlə tabutumun dalınca gəlsin...

Başsız qoyun sürüləri dünyada nə çox,
Qoy iki-üç qanan adam ötürsün məni...
Qoymazsınız, qoymazsınız balalarım, yox,
Çirkin əllər tabutumu götürsün mənim...

Gec-tez sona çatacaqdır ömür nağılım,
Gedəcəyəm bu dünyadan şeir dilimdə...
Gedəcəyəm ən birinci oğullarımın,
Bir də, bir də sözlərimin çiyinlərində...

## MƏNƏ GÖRƏ...

Könül düşmə təmənnayə,
Həyat boşdu mənə görə...
Uymaq bu fani dünyaya,
Aldanışdı mənə görə...

Hər bir dərdə yanan mənəm,
Öz-özünü danan mənəm,
Niyə doğdu anam məni,
Oda düşdü mənə görə...

Gedəcəkdik niyə gəldik?
Yaranıb ölməyə gəldik?..
Ya yuxu görməyə gəldik?
Yuxu puçdu mənə görə...

Boğuluram söz içimdə,
Əriyirəm öz içimdə,
Bəbəliyim göz açanda,
Ağlamışdı mənə görə...

Ömrümüzdən ötən illər,
Xəyal olub itən illər,
Yoxluqdan müjdə gətirən
Qaranquşdu mənə görə...

Hamımız beşgünlük qonaq,
Axırımız qara torpaq...
Yaşamaqdan yaşamamaq,
Daha xoşdu mənə görə...

## SƏNİ UNUTMAQDAN ÖTRÜ...

Ən dözülməz ağrılara, acılara tab edirəm,
Şeytandan ümid umuram, iblisə xitab edirəm,
Ürəyimin al qanını döndərib kabab edirəm,
Başıma çəkib içirəm səni unutmaqdan ötrü,
Arzumu kəsib biçirəm səni unutmaqdan ötrü...

Röyalara meyil edirəm bəlkə yadımdan çıxasan,
Gözlərimi qırpan təki görürəm mənə baxırsan...
Sən həqiqətin özüsən, ya xəyalısan, yuxusan,
Öz-özümlə döyüşürəm səni unutmaqdan ötrü,
Qabıq verib dəyişirəm səni unutmaqdan ötrü...

Köksümü cırıb açıram ayrılığın küləyinə,
Bütün keçmiş-keçənləri xəlbirləyib ələyirəm,
Qaşıq-qaşıq istiotu əndərirəm xörəyimə,
Acı-acı gülüşürəm səni unutmaqdan ötrü,
Hicran ilə öpüşürəm səni unutmaqdan ötrü...

Ay ilə həmfikir oluram uzun-uzun gücələri,
Gündüzləri sağa-sola hey ölçürəm küçələri,

Otağımda gizlənirəm sındırırsan pəncərəmi,
Ünvanımı dəyişirəm səni unutmaqdan ötrü,
Daha nə yollar düşünüm səni unutmaqdan ötrü?..

Çözələnir xatirələr, könlüm, ruhum qubarlanır,
Tarım durur əsəblərim, enir, qalxır damarlarım,
Su verirəm meynələrə, mıx vururam divarlara,
Zülmət quyuya düşürəm səni unutmaqdan ötrü,
Sinəmi söküb deşirəm səni unutmaqdan ötrü...

İş olmayan yerdə belə özümə iş gördürürəm,
Qışda qar təmizləyirəm, yayda milçək öldürürəm,
Bütün sək-rəqibləri öz üstümə güldürürəm,
Hey haldan-hala düşürəm səni unutmaqdan ötrü,
Ürəyimlə ötüşürəm səni unutmaqdan ötrü...

Səndən özgə nə vurğunam, nə möhtacam kimə isə,
Səndən qeyri olmasa da ehtiyacam kimə isə,
İstəyirəm ürəyimi qəsdən açım kimə isə,
Yalandan eşqə düşürəm səni unutmaqdan ötrü,
Mələklərlə "görüşürəm" səni unutmaqdan ötrü...

Gözümdən çətin gedəsən gözümə qor dolmayınca,
Canımdan çətin çıxasan canım rahat olmayınca,
Son ümidim, son pənahım o dünyaya qalıb ancaq,
Bu dünyamı dəyişirəm səni unutmaqdan ötrü,
Ölümə elçi düşürəm səni unutmaqdan ötrü...

## HARAY, MƏMLƏKƏTİM...

Nə toya, nə yasa gedə bilirəm,
Axı necə gedim – yas içindəyəm...
Çoxları inciyir məndən bilirəm,
Axı necə edim – yas içindəyəm...
Meydan yarışında yordular məni,
Milli Məclislərdə qırdılar məni,
Öz satqınlarımız vurdular məni,
Əyildi qamətim – yas içindəyəm...

Bu ana torpağın yarı tapdanıb,
Ayaqlar altında qalır, tapdanır,
Analar namusu, arı tapdanır,
Tapdanır qeyrətim – yas içindəyəm...

Nə vaxt ki, qəhrəman Şuşa satıldı,
Laçının torpağı, daşı satıldı,
Füzuli, Cəbrayıl qoşa satıldı,
Xar oldu millətim – yas içindəyəm...

Bütün hədəflərə nişan olmuşam,
Bütün qradlara nişan olmuşam,
Bütün şəhidlərlə bir vurulmuşam,
Sınıb qol-qanadım – yas içindəyəm...

Çoxdan tükənmişəm bir görənim yox,
Məni son mənzilə ötürənim yox,
Ölmüşəm heç yerdən götürənim yox,
Kəsilib taqətim – yas içindəyəm...

Ta eli-obası talan şairəm,
Evinə vəhşilər dolan şairəm,
Ulu Qarabağsız yalan şairəm,
Haray, məmləkətim – yas içindəyəm...

## HEYİF SƏNƏ POEZİYA,<br>HEYİF SƏNƏ...

Heyif sənə, poeziya, heyif sənə,
Necə bizim zəmanədə gözdən düşdün.
Bu dünyaya göz açalı deyim sənə,
Heç bu qədər təhqirlərə dözməmişdin?!
Sənin sevgi, məhəbbətdi əzəl andın,
Səni eşqsiz bir varlığa döndərdilər.
Kobudlaşdın, cılızlaşdın, xırdalandın,
Zirvədəydin, dərələrə endirdilər...

Sındı, düşdü sənin şahin qanadların,
Öz-özündən oğurlandın, qarət oldun,
Vəsf elədin tiranları, cəlladları,
Məddahların əllərində alət oldun...
Qulluq etdin vəzifəyə, rəyasətə,
Səni buna ustadların təhrik etdi,
Əsir oldun ada, sana, siyasətə,
Yamanlara yaxşı deyib tərif etdin.
Dilin "Urra" bağırmaqdan oldu qabar,
Poeziya! Siyasətlə qanlı bıçaq...
Siyasətin min üzü var, sifəti var,
Poeziya bir sifətdə olub ancaq...
Girdin çox-çox riyalara, oyunlara,
Heyif sənə, poeziya, heyif sənə...
"Ləbbey!"– dedin çox şahlara, əyanlara
Eyb sənə, poeziya, eyb sənə...
Sözün, şeirin çaş-baş düşdü ünvanları.
Çox şairlər yazdı əbəs, pozdu əbəs...
Zəmanənin eşq, məhəbbət dastanları,
Rəhbərlərə dastan ilə oldu əvəz...
Heyif sənə, poeziya, heyif sənə,
Birmi, beşmi itkilərin, qurbanların?..
Əyilməyən qamətini əyib sənin,
Sürüdülər mitinqlərə, meydanlara...
Oda düşdün, şəhid oldun, tələf oldun,
Kürəyində qanlı tonqal qaladılar.
Şərəfsizlər adın ilə şərəf aldı,
Fəqət sənin şərəfini taladılar...
Kül tökdülər alovlanan ocağına,
Necə dözdü vicdanları, insafları?..
Şairdəmi düşüb kütlə qabağına,
Heç ölümə, qana səslər insanları?..
Heyif sənə, poeziya, heyif sənə,
Heyif, ulu Nizamiyə, Füzuliyə...
Nə gizlədim, açığını deyim sənə,
Mən özüm də günahkaram hüzurunda...
Yer üzünü zəbt eləyən vaxtın olub,

Xeyirxahlıq Kəbəsisən, məbədisən,
Sabir kimi bir uğurlu baxtın olub,
Nakam Müşfiq taleyinin məbədisən.
Bəşər əsil söz aşiqi, söz möhtacı,
Dinlə, ürək sözlərimi deyim sənə...
Bu dünyaya qollarını gen-gen açıb,
Eşq, məhəbbət libasını geyinsənə...

## MƏN BİLİRDİM QORXULUDUR BÖYÜK EŞQ...

Çoxdan idi gözləyirdim bu günü,
Mən bilirdim bunu – belə olacaq...
Bu sahilsiz məhəbbətin, sevginin,
Bilirdim ki, sonu belə olacaq...

Mən bilirdim qorxuludur böyük eşq,
Bunu sənə dönə-dönə demişdim...
O tərsinə dönə bilər tez, ya gec,
Dönə bilər bəzən kinə demişdim...

Çoxdur onun tərəddüdü, gümanı,
Qısqanclıqdır bərabəri, əkizi...
Bəzən olur qara rəngə boyanır,
Tutulanda qəzəbindən gün özü...

Mən görmüşdüm, mən bilirdim, bilirdim,
Bədbəxt olur insan qəlbən sevəndə...
Sən bu acı həqiqətə gülürdün,
Mənmi düzəm, sənmi düzsən, de indi...

Göstər mənə sevib xoşbəxt olanı,
Sevib bədbəxt olanlarsa nə qədər...
Çox Məcnunlar oldu eşqin qurbanı,
Külə döndü gör nə qədər Leylilər...

Məhəbbətin bir sifəti inamdır,
O birisi həsrət, əzab, dərd, kədər...
Bir gün oldu azıb qaldıq dumanda,
Nagah kəsdi yolumuzu şübhələr...

Olduq dedi-qoduların gülüncü,
Aramıza girdi iblis ayrılıq...
Məhəbbətin kin ovxarlı qılıncı,
Bir də gördük öz qınından sıyrılıb...

Bir də gördük uçurumdur irəli,
Ümid, inam gördük bizdən əl üzüb...
Heç nə görmür məhəbbətin gözləri,
Görünəndə yaman üzü, sərt üzü...

Çoxdan idi gözləyirdim bu günü,
Mən bilirdim – bunu belə olacaq...
Bu sahilsiz, məhəbbətin, sevginin,
Bilirdim ki, sonu belə olacaq...

## İBLİS TƏKLİK,
## GÖZƏL TƏKLİK...

Bütün aləm öz gücündə, işində,
Mən qalmışam tənhalığın əlində.
Bu axşamlar canım üçün düşürlər,
Bu səhərlər canım üçün gəlirlər...

Canım üçün gəlir aylar, fəsillər,
Boz illəri deməyirəm hələ mən.
Təklik yağır görkəmimdən, səsimdən,
Təklik qonub ayağıma, əlimə...

Kölgəm kimi o arxamca dolanır,
Üstümdədir daim soyuq nəfəsi...
İblisə bax istəyir ki, ola o,
Mənə əziz Səfurəmin əvəzi...

Doğrayardım keçsə idi əlimə,
Amma gözə görünməyir o iblis.
Oğullarım hey yanıma gəlirlər,
Gecə-gündüz mənimlədir birisi...

Yenə məndən o çəkməyir əlini,
Öz balamın evində də təkəm mən...
Qabağıma xörək qoyur gəlinim,
O xörəyi yeyəndə də təkəm mən...

Qaşığım da, çəngəlim də təklənib,
Təklənibdir nəyim varsa, nəyim yox...
Ömrüm tamam təklik üstə köklənib,
Yeyir məni, üzür məni heyim yox...

Hara baxsam durub baxır üzümə,
Olub yorğan-döşəyimə şərikli...
Ayrı vaxtı birtəhərlə dözürəm,
Uyuyanda quduzlaşır bu təklik...

Öz toruna salıb məni elə bil,
Caynaqları dərindədir, dərində...
İlan olub çalır məni elə bil,
Sübhə kimi qovruluram yerimdə...

Yuxumda da təklik girir yuxuma,
Yuxuda da tənhayam mən, təkəm mən,
Məni anlar tənhalığın oxuna
Düçar olub bu əzabı çəkənlər...

Deyirlər ki, evlənginən, yazıqsan,
Bəlkə ağrı-acıların düzəldi...
Tez təkliyə sığınıram acıqdan,
Tez təklikdən yapışıram yüzəlli...

Deyirəm ki, uzaq getmə amandır,
Səfurəmi itirərəm yenidən.

Sən daima başım üstə dayan, dur,
Gözəl təklik, tənha qoyma məni sən...

Sən heç demə qayda imiş binadan,
Günah yoxmuş nə gedəndə, gələndə...
İnsan demə cüt doğulur anadan,
O da ölür ömür dostu öləndə...

## BAPBALACA BİR GƏLİNSƏN...

Gəlişinlə lal sükutu uçurtdun,
Bizi çılğın bir aləmə köçürtdün,
Dağlar boyda dərdimizi kiçiltdin,
Evimizin səhər banı – Səfurəm
Mehribanlar mehribanı – Səfurəm...

Xırda boyun, gözün, əlin mübarək,
Çeşid-çeşid əskilərin mübarək,
Evimizə beşik gəlib mübarək,
Həsrət idik çoxdan ona – Səfurəm,
Nisgilimiz çatdı sona – Səfurəm...

Mışıl-mışıl uyuyanda bələkdə,
Gözləyirik səni əsən küləkdən,
Ağlayırsan sevinirik ürəkdən,
Sən güləndə gülüşürük – Səfurəm,
Bəxtimizə gör kim düşüb – Səfurəm...

Nənə deyir: – çox baxmayın balama,
Nəzər dəyər mənim ciyərparama,
Göz muncuğu bağlayıbdır qoluna
Gözümüzün işığısan – Səfurəm,
Bu evin qız uşağısan – Səfurəm...

Təzə doğan ayparasan, aypara,
Yüngül olsun qədəmlərin, ay bala,

Qardaş-bacın düzülsünlər qol-qola,
Ocağımız aşıb-daşsın – Səfurəm,
Böyük adlı, kiçik yaşlı – Səfurəm...

Bizim üçün səndən dadlı gözəl yox,
Xislətində nə bir ləkə, nə şər yox,
Bu dünyada səndən təmiz bəhər yox,
Müqəddəslik heykəlisən – Səfurəm,
Bapbalaca bir gəlinsən – Səfurəm...

## MƏNİM NARAHAT YOLDAŞIM

(*yarızarafat*)

Xasiyyəti mələk kimi,
Ev-eşiyi çiçək kimi,
Sinəmizdə ürək kimi,
Atasına, anasına
Ay əsil övlad yoldaşım,
Mənim mehriban yoldaşım,
Mənim narahat yoldaşım.

Üç balası təzə qönçə,
Sözlərində min düşüncə,
Təbiəti həlim, incə,
Öz evində, eşiyində
Qurub min büsat yoldaşım,
Mənim mehriban yoldaşım,
Mənim narahat yoldaşım.

Daim sözlü, həyəcanlı,
Qaynanaya istiqanlı,
Qohumpərvər, qohumcanlı
Ay güləş, gürşad yoldaşım,
Mənim mehriban yoldaşım,

Mənim narahat yoldaşım.
Altı qızın ən incəsi,
Anasının ilk incisi,
Bacıların birincisi
Gah ağlayan, gah sevinən
Gah qəmli, gah şad yoldaşım
Mənim mehriban yoldaşım,
Mənim narahat yoldaşım.
Girib ömrün qış yaşına,
Təzə yağır qar başına.
Bircə əziz qardaşına
Ay əsil qardaş yoldaşım.
Həmi bacı, həmi ana,
Həmi qol-qanad yoldaşım,
Mənim mehriban yoldaşım,
Mənim narahat yoldaşım.

Duruşunda min ifadə,
Geyimi çox adi, sadə,
Şöhrət sevməz bu dünyada,
Sevməz nə san, ad yoldaşım,
Mənim mehriban yoldaşım,
Mənim narahat yoldaşım.

Min işi var, min gücü var,
Nə gecəsi gündüzü var,
Məktəbdə də uşaqlara
Deyiləsi çox sözü var.
Hamımıza "müəllimə"
Hamıya "ustad" yoldaşım,
Ay mənim ömür sirdaşım,
Ay mənim həyat yoldaşım...

## MƏHƏBBƏT

O, bu boyda bir cahanı yaradıb,
Yeri, göyü, asimanı yaradıb,
İnsan onu, o insanı yaradıb,
Bu həyatın əlifbası – məhəbbət,
Ən ilk nəğmə, ən ilk yazı – məhəbbət.

Hər ömürdə bir ulduza dönər o,
Gah şimşəktək birdən çaxar, sönər o,
Gizli gələr, fəqət aşkar dinər o,
Canda nəfəs, damarda qan – məhəbbət,
Həm var olan, həm yox olan – məhəbbət!

O dəryadır kükrəyəndə, daşanda,
O almazdır üzüklərin qaşında,
O sevdadır, hey dolanır başımda,
Həm həqiqət, həm əfsanə – məhəbbət,
Gah ağıllı, gah divanə – məhəbbət.

## BABAM SÖZ VERİB Kİ, SABAH GƏLƏCƏK...

*Seyfəddin Dağlının xatirəsinə*

Birdən qəm gətirdi familin, adın,
Bizi tərk elədin birdən, nədəndir?!
Sən öləndən sonra yaxşı olmadın,
Sən elə sağ ikən yaxşı adamdın.
Yaxşı xırda sözdür sənin yanında,
Böyükdün, büllurdun məhəbbətinlə.
Səhvsiz adam olmur guya cahanda,
Amma sən səhvsizdin öz xilqətinlə.
Bir qarış torpağa necə uzandın,
Sanki cahan bir az boşaldı o gün,

Kişilər ağladı sənin yasında,
Daş ürəklər belə yumşaldı o gün.
Bütün ah-nalələr ürəkdən oldu,
Bütün göz yaşları axdı ürəkdən.
Hamı qəlbdən dedi: o heyif oldu...
Xatirən sağalmaz dağdı ürəkdə.
Yaşı səksən anam, ömrü qış anam,
Min-min ölüm görüb yorulmuş anam,
Tamam göz yaşları qurumuş anam,
Ah, necə nalələr çıxartdı o gün,
Gözündə leysanlar axıtdı o gün,
– Neyləyim, nə gələr əlimdən – dedi:
Kaş ki, mən öləydim yerində,– dedi.
Sən bizim mötəbər ustadımızdın,
Cəfərli ömrümüz, həyatımızdın.
Daha heç bir zaman dönməyəcəksən,
Şirin xatirəsən daha bu gündən.
Bilirik geriyə dönməyəcəksən,
Axı, kim dönüb ki, dönəsən sən də.
Gah döyüş görmüşük, gah qan görmüşük,
Odlardan salamat çıxan görmüşük,
Gülldən yatanlar dirilib bəzən,
Dəryada batanlar dirilib bəzən,
Başında bombalar partlayıb çıxan,
Qatarlar altından xortlayıb çıxan,
Adamlar görmüşük, olub, görmüşük,
Hələ min-min diri, ölü görmüşük...
Tək bircə qəbirdən dönən olmayıb,
Bir yol o dünyadan gələn olmayıb.
Belə möcüzəyə inanmıram mən,
Axı kim dönüb ki, sən də dönəsən?!
Yarıda qırıldı nə qədər sözün,
Çox işin, çox işin qaldı yarımçıq.
Amma ən vacibi, ən gərəklisi –
Nəvənlə görüşün qaldı yarımçıq.
Ona söz vermişdin gələrəm sabah,
Yatdın, ta səninçün sabah olmadı.

O elə hey deyir: – Tez gəl, ay baba,
Bəs niyə gecikdin, baba, olmadı?!
Sonası yamanca qubar eləyir,
Boylanır qapıya pərişan, kövrək,
Tez-tez bu sözləri təkrar eyləyir:
Babam söz verib ki, sabah gələcək...
Sən yerə salmazdın onun sözünü,
Yaman inanıram mən o uşağa.
Bəlkə onunçun açdın gözünü,
Bəlkə onunçun qalxdın ayağa.

## CAVANLIĞIM

Həyatımın tacı idi
Qara gözlü cavanlığım.
Eşq, məhəbbət acı idi
Qara gözlü cavanlığım.

Ürək kimi döyünərdi,
Nə bir qəmi, nə bir dərdi.
Çox illərə sinə gərdi,
Durdu, dözdü cavanlığım.

Dava idi, dərman idi,
Təbib idi, loğman idi,
Bir çağlayan ümman idi,
Gur dənizdi cavanlığım.

Arzulara adlayardı,
Qönçə kimi çatlayardı,
Gözəlləri odlayardı,
Qaynar, isti cavanlığım.

Çöldə bitən bir laləydi,
Meylə dolu piyaləydi,
Dağ uçuran şəlaləydi,
Oddu, közdü cavanlığım.

Şimşəkləri üzdü, yordu,
Nə dayandı, nə yoruldu.
Ah, nə şəffaf, nə büllurdu,
Nə təmizdi cavanlığım.

Təbiətin nemətiydi,
Sevgilərin məbədiydi,
Sanardım ki, əbədiydi,
Tükənməzdi cavanlığım.

Ömrü çiçək qədər oldu,
Sevinc oldu, kədər oldu,
Neçin gəldi-gedər oldu,
Kimdən küsdü cavanlığım?

## YANDIRDI MƏNİ...

*Mərhum həkim dostum*
*Həsən Nəcəfzadənin əziz xatirəsinə*

Sən getdin dünyadan düşəndə ilk qar,
Sən getdin həyatdan cavan çağında.
Səndən əvəz qaldı dostlar, tanışlar,
Səndən əvəz qaldı üç uşağın da.
Böyüklər düşdülər alova, oda,
Ağlayıb doldular sən ölən kimi.
Uşaqlar bu yası qanmasalar da,
Saralıb soldular sən ölən kimi.
Adi həkim idin, böyük bir insan,
Ömürdən, həyatdan heç doymamışdın.
Gülüşün səmimi, sözün mehriban,
Pisliyə qəlbində yer qoymamışdın.
Deyib-gülən idin, xoşqılıq idin,
Təpədən-dırnağa yaxşılıq idin.
Cismən uyusan da soyuq məzarda,
Ruhən ürəkdəsən, ruhən candasan.

Köç edib ötsən də soyuqda, qarda,
Bir istilik qoydun bu cahanda sən.
Bax, həmin istilik odlayır məni,
Hayana qaçıram adlayır məni.
İstiyə düşürəm alovlandırır,
Soyuğa düşürəm yaxır, yandırır,
Deyirəm bu qədər oda yanmayım,
Salım pisliyini yada, yanmayım.
Görürəm səninlə keçən hər günü,
İlhamım yatırmı sapa bilmirəm?!
İynə ucu boyda bir pisliyini,
Çıraqla gəzirəm, tapa bilmirəm.
Sinəm həsrətinlə düyündür, ahdır,
Eh, yaxşı olmaq da bir cür günahdır.
Bir az pis olsaydı, pis olardımı,
Dünya uçardımı, dağılardımı?!
Sənsən xəyalımda hər qış, hər bahar,
Ey dost, xoşqılığın yandırır məni.
Adamı deyərlər pislik yandırar,
Sənin yaxşılığın yandırır məni.

## BİLMİRƏM

Sən gedəndən, ay bacı,
Gündüz, gecə bilmirəm.
Mən necə ömür eləyim
Sənsiz necə, bilmirəm.
Sən qırx beş il yaşadın,
Bəs mən nə qədər ömür
Edəcəyəm – bilmirəm.
Çiynimdə getdin, bacı,
Mən kimlərin çiynində
Gedəcəyəm – bilmirəm.
Kənd qəbiristanındasan,
Atamın yanındasan,
Babamın yanındasan.

Mən harda basdırılıb,
Bitəcəyəm – bilmirəm.
Hər bir şeyə bilmirəm,
Nə vaxt göz yumacağam,
Onu bircə bilmirəm,
Sonrasını demirəm.
Başıma nə gələcək,
Lap indicə – bilmirəm.
Sən çox yaxşı yaşadın,
Məndə necə olacaq,
Son nəticə – bilmirəm.

## ANAM, CAN VERMƏ, CAN VERMƏ

*Anam Qızılgülə son vida*

Əziz anam, canım, gözüm,
Anam, can vermə, can vermə!
Qoy laylanı deyim özüm,
Laylam, can vermə, can vermə!

Sənsiz ömrü talan ollam,
Qəm mizrabın çalan ollam,
Can alanın canın allam,
Allam, can vermə, can vermə!

Əl-ayağın buz olsa da,
Bədənin köz-köz olsa da,
Dərdin əlacsız olsa da,
Loğman, can vermə, can vermə!

Quruca nəfəsin, sözün,
Havam, suyum, əzmim, gücüm,
Sən dünyasan mənim üçün,
Dünyam, can vermə, can vermə!

Al mənim qalan ömrümü,
Al övlad, bala ömrümü,
Ömrünə cala ömrümü,
Dayan, can vermə, can vermə!
Odlayır göyləri ahım,
Ümidim, arxam, pənahım,
Mənə can verən Allahım,
Canım, can vermə, can vermə,
Anam can vermə, can vermə!

## SƏN ELƏ BİR VAXTDA RAST GƏLDİN MƏNƏ...

Sən elə bir vaxtda rast gəldin mənə,
Qurumuş bulağam, bulanmış suyam...
Sən elə bir vaxtda rast gəldin mənə,
Oxunmuş nəğməyəm, çalınmış toyam.

Nə gücüm çatdı ki, səndən yapışım,
Nə gücüm çatdı ki, səndən qaçam mən...
Nə odum oldu ki, yanam, alışam,
Nə sehrim oldu ki, cavanlaşam mən...

Sən elə bir vaxtda rast gəldin mənə,
Ömrün payız fəsli, xəzəl çağıydı...
Sən elə bir vaxtda rast gəldin mənə,
Sənin gəncliyinin gözəl çağıydı...

Nə deyə bildim ki, tutmaz sevdamız,
Nə deyə bildim ki, tutar bizimki...
Bizimdir səmada axan o ulduz,
O uzaqda itən qatar bizimdi...

Sən elə bir vaxtda rast gəldin mənə,
Dayanıb durmuşdum yol ayrıcında...
Sən elə bir vaxtda rast gəldin mənə,
Bir üzüm cavandı, bir üzüm qoca...

Nə deyə bildim ki, sevən çağımdı,
Nə dedim sevirəm mənə dayaq ol...
Nə deyə bildim ki, mənə yaxın dur,
Nə deyə bildim ki, məndən uzaq ol...

Sənə elə bir vaxtda rast gəldin mənə,
Ömrüm eşq badəsi içilmiş idi...
Sən elə bir vaxtda rast gəldin mənə,
Mənzilimin çoxu keçilmiş idi...

Nə deyə bildim ki, ürəksən mənə,
Nə deyə bildim ki, ürək deyilsən...
Nə deyə bildim ki, gərəksən mənə,
Nə deyə bildim ki, gərək deyilsən...

Sənə elə bir vaxtda rast gəldin mənə,
Bu necə fəsildi, necə vaxt idi...
Sənə elə bir vaxtda rast gəldin mənə,
Bu necə taleydi, necə bəxt idi...

Nə deyə bildim ki, pənahsızam mən,
Nə deyə bildim ki, pənah məndədir...
Necə deyəydim ki, günahsızam mən,
Nə deyə bildim ki, günah məndədir...

Sən elə bir vaxtda rast gəldin mənə,
Özüm öz halıma gülmək istədim...
Sən elə bir vaxtda rast gəldin mənə,
Təzədən dünyaya gəlmək istədim...

## HƏRDƏN DURUB...

Hərdən durub bu dünyaya
ağlayıram,
Dirisinə ağlayıram
ölü kimi.
Zaman-zaman təziyəsin
saxlayıram,

İtirdiyim əzizlərin
biri kimi...
O nə qədər məzar görüb,
kəfən görüb,
Onu min yol dara çəkib,
öldürüblər.
Anasına əl qaldıran
nankorlara,
Mən öz şair nifrinimi
bildirirəm...
Ağlayıram viran olmuş
dam-daşına,
Minlər ilə sönən isti
ocağına...
O taydakı milyon-milyon
qardaşıma,
Bu taydakı düşmən gəzən
torpağıma...
Xəyallarım uzaqlara
uçub gedir,
Ürəyimi didim-didim
dağlayıram.
Lap az qala iki əsr
keçib gedib,
Türkmənçay sazişinə
ağlayıram...
Ağlayıram zaman-zaman
dəfn olunan,
Özü itən, adı qalan
millətlərə,
Bu torpaqdan o torpağa
sürgün olan,
Eli talan, yurdu talan
millətlərə...
Nə görüb ki, yer kürrəsi
göz açandan,
Dava görüb, dalaş görüb,
zillət görüb...

Zəli kimi yapışıblar
boğazından,
Addımbaşı qoruq görüb,
sərhəd görüb...
Bu qədər də dövlət olar,
ölkə olar?
Hərə onu bir cür söküb,
parçalayıb...
Öz əvəzsiz meşələri
ola-ola,
Raket, bomba basdırıblar
hər çalaya...

II

Ağlayıram vaxt-vədəsiz
itənlərə,
Qalanlara, ölənlərə
ağlayıram...
Ağlayıram bizdən əvvəl
gedənlərə,
Bizdən sonra gələnlərə
ağlayıram...
Ta dünyaya ayaq basmaq
mümkün deyil,
Ta analar, doğuluşu
dayandırın...
Ta adamlar bir-birini
didib-yeyir,
İnsan adı ucuzlaşıb,
puça çıxıb...
Dünya kimi daha qorxunc
qoruq yoxdur,
Bu mənəvi viranlığa
ağlayıram...
Heyvanlarda insanilik
daha çoxdur...
İnsanlarda heyvanlığa
ağlayıram...

III

Ağlayıram məhəbbətsiz
gözəlliyə,
Sevgi yoxsa dünya niyə
durur onda?..
Sevgi varsa siz söyləyin
axı niyə,
Niyə bəşər bir-birini
qırır onda?..
Alimlərə ağlayıram
nə qədər gör,
Onlar raket miras qoyub
cahan üçün...
Vəhşidən də gərək vəhşi
olasan ki,
İnsan ölüm kəşf eləyə
insan üçün...
Şairlərə ağlayıram
hamıdan çox,
Cahangirlər vəsf eləyən
şairlərə...
Haqsızlıq, qan hər gün
dizə çıxa-çıxa,
Bu həyata cənnət deyən
şairlərə...
Kimsə görmür yaşlar axır
ürəyimdən,
Qala-qala, ölə-ölə
ağlayıram...
Heç kişi də ağlayarmı,
amma ki, mən,
Yekə kişi ola-ola
ağlayıram...

## SƏRVƏTİM BİR QƏLƏM, BİR VARAQ...

Özümə var-dövlət yığmadım,
Sərvətim bir qələm, bir varaq...
Heç bircə manatım yox mənim,
Axirət günümə qoymağa...

İllərim, aylarım laxlayır,
Saçlarım bürünüb düm ağa.
Heç bircə manatım yox mənim,
Axirət günümə qoymağa...

Evimi, bankları yoxlayın,
Yoxlayın, necə ki, mən sağam...
Heç bircə manatım yox mənim,
Axirət günümə qoymağa...

Milləti taladı çoxları,
Yenə də gözləri doymadı...
Heç bircə manatım yox mənim,
Axirət günümə qoymağa...

Zənginlər rəqibim, düşmənim,
Kasıblar şərikim, ortağım...
Nə olsun manatım yox mənim,
Axirət günümə qoymağa...

Mən pula, altuna sığmadım,
Sığındım şeir adlı bir dağa...
Nə olsun manatım yox mənim,
Axirət günümə qoymağa...

Gözümü yumanda yox qəmim,
Sözlərim qalxacaq ayağa...
Nə olsun manatım yox mənim,
Axirət günümə qoymağa...

Şeirlə yasımı saxlayın,
Şeirlə tapşırın torpağa...
Mən sözdən xəzinə topladım,
Axirət günümə qoymağa...

## YUXULAR, YUXULAR...

Gözümü yuman tək
yuxular görürəm,
Ömrümün illəri
qayıdır geriyə;
Yuxuda neçə yol
dirilib ölürəm,
Yuxular görürəm
qəribə, qəribə.
Ağ yuxu, sarı yuxu, qırmızı,
boz yuxu;
Çox olur səhv yuxu,
az olur düz yuxu.
Yuxuda görürəm atamı,
bacımı,
Yuxular görürəm
şirinli, acılı.
Ən çox da anamı
görürəm yuxuda,
Ağarmış saçını
hörürəm yuxuda.
Deyirəm: – Ay ana,
ay sənə qurban,
Nə yaxşı Cabiri
tək-tənha qoymusan.
Sən mənsiz dözməzdin,
ay canım, ciyərim!
Nə vaxtdır sənsizəm,
de varmı xəbərin?!
Pozulub büsbütün
həyatın axarı,

Payıza dönübdür
ömrümün baharı.
Mən sənsiz bu yaşda
bir yetim kimiyəm,
Qırılıb sökülmüş
tar, kaman kimiyəm.
Qanadı vurulmuş
sərgərdan bir quşam,
Dururam pərişan,
gəzirəm pərişan.
Gözümü yumuram,
gözümdə durursan,
Sözümə, şeirimə
aşiyan olursan.
Həmişə qulaq asmısan
oğluna;
Deyirəm: mənimlə
qalginən, ay ana!..
Deyirsən: ay Cabir,
ta mənim evim var,
Əbədi məkanım
o qəbir, o hasar.
Sən özün tikmisən
onu ki, sən, bala;
İzn ver evimə
mən gedim, can bala!..
Gəlirəm məzarın
dururam başında,
Uşağa dönürəm
bu ahıl yaşımda.
Yenə də o soyuq başdaşın,
qəbirin;
Sinənin üstünə tər güllər
səpirəm.
Yenə də tükənmir
fərağım, həsrətim.
Ay anam, ay mənim
tez solan cənnətim!..

Əlini mənə ver
əlindən yapışım,
Səninlə bir yerdə
dağlara qarışım...

## MƏNİ

Gülüm o gündən ki,
oduna düşdüm,
Atdın yanar-yanar
küllərə məni.
Qaldım dəryalarda
tənha gəmi tək,
Tutdun tufanlara,
sellərə məni.
Gah göyə qaldırdın
məhəbbətinlə,
Saxladın ən uca
pillədə məni,
Gah kin-küdurətlə
elə baxdın ki,
Endirdin əlçatmaz
zirvədən məni.
Gah tutdun ruhumu
sarı sim üstə,
Gah çəkdin dəmlərə,
zillərə məni.
Bəlkə səhv saldın
tanışlarınla,
Hələ de bənzətdin
kimlərə məni.
Yollar ayrıcında
azıb qalmışam,
Qaytar o əvvəlki
illərə məni.
Soyuq baxışınla
yandır atamı,

Laqeyd gözlərinlə
güllələ məni.
Qurtulum bu boyda
dərddən, bəladan.
Qoy anam aparsın
pirlərə məni.

## BOŞ DÜNYADIR, ÇAŞ DÜNYADIR

Bu dünya düzələn deyil,
Ürəyi soyuq dünyadır;
Qəmləri sağalan deyil,
Dərd bəladan tox dünyadır.

İlk gündən vəfası yoxdur,
Keyfindən cəfası çoxdur;
Kürəyi oyuq-oyuqdur,
İpləri qırıq dünyadır.

Ondan razı kəs görmədim,
Bu boyda məhbəs görmədim;
Bu boyda qəfəs görmədim,
Gör necə yoluq dünyadır.

Uçurub minlərlə tacı-taxt,
Milyonları edib bədbaxt;
Ondan aman umma heç vaxt,
Əsgisi yanıq dünyadır.

Altında min bir çaparı,
Bir-bir hamını aparır;
Yaxşı-yamanı aparır,
Ölümə muştuluq dünyadır.

O hamının yaşındadır,
O hamını yeyir udur;
Hərədən baş-daşı durur,
Həm var, həm də yox dünyadır.

Bəşər bir-birinə dəyə,
Heyifi gəlməz kimsəyə;
Günəş nurunda çimsə də,
Yaman qaranlıq dünyadır.

Nəyinə diri deyirlər,
İblisdir hürü deyirlər;
Allahın sirri deyirlər, –
Boş dünya, fındıq dünyadır,
Çaş dünya, zındıq dünyadır.

## BİR YEKƏ TƏNHALIQ İÇİMDƏ...

Çoxdan çığırır səksəkə
tənhalıq içimdə,
Ömrüm, həyatım təhlükə
tənhalıq içində.
Səbrim tükənib, fikrim azır,
neyləyim Allah,
Öz karvanını ki, çəkə
tənhalıq içimdən.
Hər gün gəmirir varlığımı,
çeynəyir hər gün, –
Qorxum budu ki, ev tikə
tənhalıq içimdə.
Sancıb qara zil bayrağını
düz başım üstən, –
Bir meydan aça, yol çəkə
tənhalıq içimdən.
Sürsün atını dördnala
qırmancı əlində, –
Açsın yekə bir mərəkə
tənhalıq içimdə.
Cabir, o zamandan ki,
xəyal oldu əzizin, –
Fəryad qoparır bir yekə
tənhalıq içimdə...

## SƏN GETMİSƏN...

Sən getmisən,
sanma sevgim yox olub.
O ölməyib, yaşayır,
əvvəlki tək.
O səninlə, mənim ilə
doğulub,
O son dəfə mənim ilə
öləcək.

***

O taledən ikimizin
payıdı,
İkimizin ürəyində
göyərdi
Zaman-zaman neçə ildi,
ay idi,
Hər gün bizim qəlbimizi
döyərdi.

***

O düşmüşdü ağızlara,
dillərə,
Nəğmələrin qanadında
uçurdu.
Şeir olub dolaşırdı
elləri,
Öz qoynunu sevənlərə
açırdı.

***

Müqəddəsdi... yaranmışdı
çün haqdan,
Onu əyə bilməmişdi
bir fələk.

Çıxmışdı hər imtahandan,
sınaqdan,
İki ürək olmuş idi
bir ürək.

***

Nə qədər ki, yaşayıram
mən varam,
O da sağdır, demək o da
yaşayır.
Ona bir yad nəfəs dəyə,
qoymaram,
Mən bu yolda ağartmışam
başımı.

***

İllər ilə yar qadasın
yar alar,
İndi biz tək sevən
hanı, əzizim?
Biz ikimiz o dastanı
yaratdıq,
Mən, sən yazdıq o dastanı
əzizim.

***

O dastanın öz ünvanı,
öz adı.
Yalnız gülüm,
bizim ikimiz olduq,
Həmi onun müəllifi,
ustadı,
Həmi onun qəhrəmanı,
biz olduq.

***

Güc alıram daim onun
gücündən.
Onu yalnız zaman,
silə biləcək.
O sədadır, o nalədir,
içimdə.
Yalnız gülüm, o mənimlə
öləcək.

## SƏNSİZ DÜNYA YOXDUR

Mənim tənha qoyub,
gedən əzizim.
Sənsiz yaşamaqda
məna görmürəm.
Elə bil tutulub tamam,
sağ gözüm.
Bir gözlə necədir, dünya,
görmürəm.

***

Qışı qış görmürəm,
yazı-yaz gülüm.
Toyu-toy görmürəm,
yası-yas gülüm.
Dolaşıb ünvanım,
işim, mənzilim.
Gündüzdür, gecədir
dünya görmürəm.

***

Həyat gözlərimdə,
gözündən batıb.
Az qala yadımdan

çıxıbdır adım.
İtibdir hər şeyin
ləzzəti, dadı.
Şirindir-acıdır,
dünya bilmirəm.

***

Əzilib sınmışam,
daşlıq içində.
Boz daşa dönmüşəm,
daşlıq içində.
Gəzib dolaşıram,
boşluq içində.
Nə şeydir, nəçidir,
dünya bilmirəm.

***

Canlıyam, ya nəyəm,
baş açmayıram.
Göydəyəm, yerdəyəm,
baş açmayıram.
Bəlkə sehrdəyəm,
baş açmayıram.
Kələk, tapmacadır,
dünya bilmirəm.

***

Dünya tamaşadır,
belə deyiblər.
Sənsiz o tamaşa,
bitdi heyiflər.
Qaldı sənlə keçən
ömrüm seyfdə,
Dumanlı bacadır,
dünya bilmirəm.

## BÖYÜMƏYƏ TƏLƏSMƏ

*Balaca Fatimə üçün*

Saf dağ çeşmələri tək,
Gözləri duru qızım.
Yanaqları gül-çiçək,
Ürəyi nurlu qızım.
Dünyada ola bilməz,
Sənin tək saf, müqəddəs.
Sən başdan-ayağacan,
Təpədən-dırnağacan
İlkinliyin rəmzisən,
Təmizlərin təmizisən.
Əllərin totuq-totuq,
Tellərin vəsmə-vəsmə.
Sənə qurban olduğum,
Böyüməyə tələsmə.
Dünya işləklərinə
Uyma çox da, ay qızım.
Onda bircə gilə də
Vəfa yoxdur, ay qızım.
Sənin qadan alaram,
Qaşı, kirpiyi əsmər.
Bir daha yalvarıram,
Böyüməyə tələsmə.

## KÖNLÜM

Yenə çağlayıb daşırsan,
Ay mənim havalı könlüm.
Zirvələr keçib aşırsan,
Yox səbri-qərarın könlüm.

Yanırsan kürül-kürül sən,
Gahdan ağlayıb gülürsən.
De, necə çəkə bilirsən,
Bu qədər məlalı könlüm?

Bu nə eşqdir, həvəsdir,
Bir nəfəs dər yavrum, bəsdir.
Səbrin sonsuz tükənməzdir,
Dözümdən qalalı, könlüm.

Uzun dövrlərdi hər gün,
Səninlə başlayır ömrüm.
Gah aydın, gah tutqun, çiskin,
Gah da müəmmalı, könlüm.
Necə nəfəsim var, sağam,
Səninlə bir olacağam.
Sən duranda duracağam,
Hamıdan vəfalı könlüm.

## ƏN ÇOX

Ən çox təəssüf etdiyim,
həm də təəccüb etdiyim
Nə büllur saraylar,
nə xarici banklarda
milyonları olanlardı.
Qabağına tuman, tursik töküb,
Alver edən oğlanlardır.
Xəcalətdi, cinayətdi
orda düşmən
Qarabağı əsir alıb.
Burda bunlar altlarına
həsir salıb
Qabağına corab, papaq,
dəmir-dümür töküb
satır.
Bir zırpını gördüm o gün
kömür satır.
Bu nə cürə el oğludur,
bəradərdir.
Şuşa kimi bir qalanı
qoyub qaçıb,

satıb qaçıb.
O satdığı pullar ilə
neçə-neçə şadlıq evi
alıb açıb.
Gündə-gündə toy eyləyir
şənlik qurur.
Bərəkətmiş başdan-başa
Şuşa pulu,
Şuşa haqqı.
Allah haqqı, imam haqqı,
vicdan haqqı.
Burayacan bir qarışqa
tapdamayan
Şair Cabir
Pozub bütün qanunları,
qaydaları,
Yandırardım ataların,
asdırardım tək-tək,
bir-bir.
Ən dəhşəti,
ən vəhşəti
ondadır ki, atam
oğlu
O dünənki satqın, oğru
Mənim ilə bir torpağın
üstündədir,
bir səmanın
altındadır.
Bu torpağın min bir cürə
nemətini
yeyir, dadır.
Üstündən də bulaq suyu
nuş eyləyir,
əhvalını xoş eyləyir.
Rahat-rahat gəzir, yatır,
Dilində də vətən adı
Gəlin sizə nişan verim
mən onları.

Çox görmüşük
belə-belə məlunları,
Belə-belə bədzatları.
Kişilikdən tamam uzaqdır
adları.
Hamı deyir gur səsiylə
övladıyam bu vətənin.
İşim yoxdur özgəsiylə
Belə sözlər üyütməyə
haqqım yoxdur hələ mənim.
İndi Cıdır meydanında
yadlar gəzir.
Laçın əsir, Ağdam əsir.
Adım azad, özüm əsir.
Kəsin, qollarımı kəsin,
Qırın, qıçlarımı qırın,
Dil-ağzıma cida vurun.
Bu vətənə mən deməyim
bir də vətən.
Nəhəng bir məmləkət idin
gözümüzün qabağında.
Günün günorta çağında
dönüb oldun
xırda, vətən.
Paralandıq, parçalandıq,
şaqqalandıq,
Neçə yerdən yaralandıq.
Bu vətənə haqqım yoxdur
mən çağırım
bir də vətən.
Haqqım yoxdur o da
mənə oğul desin.
Nə olsun ki, dildə ona
”can” deyirsən,
Yolunda ölməmisənsə,
sən əsil oğul
deyilsən.

Bunun üçün
minlər ilə
imkan olub.
Bu gün də var, sabah da
var.
Meydan da var, vuruş da var,
silah da var.
Nə çox, nə az bir canı var
hərənin də.
Qalanın da, ölənin də.
İgidin də, qorxağın da,
kölənin də.
Vətən millətin
yeridir.
Vətən düşmən çəpəridir.
Sevgimizin hasarıdır,
O keçilməz
Şah dağıdır.
Tək Allahdan aşağıdır.
O, hamının beşiyidir,
məzarıdır.
Ucalardan ucası vətən,
Hamının soykökü vətən.
Hamının böyüyü vətən,
Hamının şəriki vətən.
Vətən hava, su, çörəkdir.
Vətən bir amaldı, yoldu.
Hamının vətəni təkdir,
Mənimki ikisi oldu.
Biri yad ocağı oldu,
Bu gözümün dağı oldu.
Ha çalışdım birləşdirəm,
Olmadı bu sayda qaldı.
Birisi o
tayda qaldı,
Birisi bu
tayda qaldı.

## MƏNİM YETMİŞ İLLİK ÖMRÜM

Mənim yetmiş illik ömrüm
nə tez belə gəlib getdin?
Bir də axı niyə gəldin,
çağıranmı oldu səni?
Birdən-birə qeybə çıxdın,
durna olub
hara uçdun?
Beləcə kim qovdu
səni,
beləcə kim yordu səni?

***

Haçan açdın qapımızı
çağrılmamış qonaq kimi?
Sən belə bir səxavətlə
nə tez girdin
kandarımdan?
Əsdi qəlbim gəlişindən
bir saralmış yarpaq kimi,
Mən nə təhər vida deyim
yetmiş illik baharıma?

***

Yetmiş illik payızıma
xudahafiz necə deyim?
Necə atım öz ömrümdən
o illəri necə axı?!
O illərin meyvəsidir
hər bir arzum, hər istəyim.
Lap elə bil dünən idi,
sütüllüyüm, cavanlığım.

***

Aşiqliyim, məhəbbətim
lap elə bil dünən idi.
Elə bil ki, dünən idi

kəsdiyimiz əhdi-peyman.
Bu sevginin seyrəngahı
mənim şair sinəm oldu.
Bir yaşadıq bu şövq ilə
dövr-dövr, zaman-zaman.

***

Lap elə bil dünən idi
nişan günüm, toy-düyünüm.
Lap elə bil dünən idi
bu dünyaya gəldi Mirzəm.
Möcüzəydi qoca dünya
mənim üçün həmən günü,
Sonra Vüqarı, Müşfiqi
pay elədi Tanrı bizə.
Aman, aman, sərt taleyin
üzü döndü birdən-birə.
Birdən-birə fəryad qopdu
dağımızdan, daşımızdan.
Mən heç zaman inanmazdım
qızıl anım ölə bilər.
Xəyalıma gəlməyənlər
gəldi bizim başımıza.

***

Anam getdi az keçməmiş
ömür dostum xəyal oldu.
Getdi qardaş bərabəri
taleyi kəm bacım getdi.
Arzularım, istəklərim,
dağıldı payimal oldu.
Əlim çıxdı əllərindən
qollarımın gücü getdi.

***

Gəl oturaq deyim sənə
istəyimi, gileyimi
Belə vaxtsız gəlmək olmaz

dön geriyə, çön arxaya.
Çön arxaya, qayıt geri
eləcə gəldiyin kimi.
Yetmiş illik ömür dostum
sözüm yoxdur sənə daha.

## MƏN VİCDANLA YAŞAMIŞAM

Mən vicdanla
yaşamışam – bu peşəm.
Bir kimsəyə
dəyməyibdir pisliyim.
Öz yolum var
bu həyatda demişəm.
Öz yurdum var,
öz soyadım, öz köküm.

***

Oxumuşam öz nəğməmi
daima
Ya öz əqidəm, öz məramım,
öz işim,
Dayım olub
bel bağlayım dayıma.
Tanrı mənə nə veribsə,
bəxşişim.

***

Misralarım öz qanımdan
süzülüb,
Nəyim varsa, özümündür,
mənimdir.
Tanıyırlar şeir ədamı,
sözümü.
Hələ çox-çox
sehr yatır təkimdə.

***

Süfrəmin də öz ləzzəti,
öz dadı.
Üstündə də hər nə varsa,
halaldır.
Orda bircə haram tikə
olmadı.
Bu ömrümə əsil
cahi-cəlaldı.

***

Çox görmüşəm
millətimin dilində,
Sətirlərim
alovlanır, közərir.
Onunçün də çəkinmirəm
ölümdən.
Ölümləri öldürəcək
sözlərim.
Ölüm yoxdur o şairə
vallahi
O şairə onu vətən,
xalq sevir.

## ŞEİRDİR

Allahım şeirdir,
cəddim şeirdir.
Sərhədim şeirdir,
səddim şeirdir.
Mənim toxunulmaz
dövlətimdir o.
Şeirlə yazıram
qanunları mən.
Sözlə qandırıram
nadanları mən.
Heç vaxt tükənməyən

sərvətimdir o.
Onun sədasıdır
qulaqlarımda.
Misralar tökülür
barmaqlarımdan.
Haqqım, ədalətim,
ruhum, amalım.
Həyata yüz cürə
qəliz sualım.
Daimi sirdaşım
danışdırdığım.
Hər bir misrasına
naxış vurduğum.
Hər bir əzabına
sinə gərdiyim.
Bütün qocalığım,
bütün gəncliyim.
Şeirdir, şeirdir
ölməz şeirdir.
Hər sükut, hər səda,
hər səs şeirdir.
Qəlbimin balıdır,
pətəyi onun.
Ömrümün balıdır
itiyi onun.
O durur özümdən,
balamdan əvvəl.
Mənimçin əbədi
silah və səngər.
Poladdan tökülmüş
qalam şeirdir.
Bir körpə gülüşü
əla şeirdir.

***

O coşar qanımda,
damarlarımda
O daim səslənir

könül tarımda.
Mən onu yazmıram
o məni yazır.
O düşmən çəpəri,
o düşmən yası.
O dostun fərəhi,
dostun sevinci.
Açır varlığımda
o qönçə-qönçə...
Təkcə qələm ilə yazmıram
onu.
Qanımdır çağlayır
misralarımda.
Təkcə əlim ilə
yazmıram onu
Yazıram büsbütün
əzalarımla.
Başı səmadadır,
ayağı yerdə.
O mənim dərmanım,
o mənim dərdim.
Sonsuz həyəcanım,
narahatlığım
Gecələr baş-başa verib
yatdığım,
Salamat durduğum
günüm şeirdir.
Quranım, imanım,
dinim şeirdir.
Daddığım ən dadlı
təam şeirdir.
Qələmim, dəftərim,
masam şeirdir.
Şeir yazmayanda
zəifləyirəm.
Mən nəyə gərəyəm
onsuz deyirəm.
Mən kimə gərəyəm,

kimə siz deyin,
Tamam tükənibdir
yoxsa söz yüküm?
Özüm-özümdən
şübhələnirəm.
Az qala yaralı
şirə dönürəm.
Elə ki, sözümün
gözü açılır,
Tamam unudulur
ağrı-acılar.
Misradan-misraya
mən adlanıram,
Qaçıram, uçuram,
qanadlanıram.
İnsan hər bir
şeyin dərd-əlacıdır.
İnsan söz mülkünün
zərrin tacıdır.
İnsandır dünyanın
ən ulu şeiri.
Əbədi nəğməsi,
uğurlu şeiri.
Sonuncu ünvanı insandır
ancaq,
İnsandı, insandır
insan olacaq.
Ömrümün səmadan
yadigarıdır,
Qiyməti olmayan yadigarıdır.

## YAZMAQ İSTƏYİRƏM

Yazmaq istəyirəm,
çıxmayır heç nə.
Amma yazmasam da,
dura bilmirəm.

Şeir yazılmayır
acıqla, güclə,
Olmaya düşmüşəm
tora bilmirəm.

***

Olmaya uçubdur
ilham,
o pərim.
Olmaya qələmim
ovxardan düşüb.
Bəs onda söz, şeir yazmaq
əsəri,
Başıma siz deyin,
bəs hardan düşüb?

***

Axı, könül tarım
heç vaxt, heç zaman,
Kökdən düşməyibdir
bu ola bilməz.
Mən onu həmişə
saz saxlamışam.
Yox, o yarı yolda
yorula bilməz.

***

İlhamdan gileyim
olmayıb, əsla.
O daim çağlayan
bulaq kimidir.
O ayrı möcüzə,
ayrı bir əsrar,
O bitib-tükənməz
bir dağ kimidir.
İlhamsız şairlər olub,
çox heyif.
Necə şeir yazır,

ilhamsız qoçaq?
İlhamsız şairmi
olar, siz deyin?
İlhamsız sənətkar
közsüz bir ocaq.

***

Şairə ilhamdan
maya gərəkdir
Bunu Müşfiq deyib,
çox gözəl deyim.
İlhamsız havayı
söz çeynəməkdir,
İlhamsız şeirə dönmür
hər deyim.
İlham hər şeirə
özül kimidir.
İlhamsız şairlər
nahaq ötürlər.
İlhamsız şairlər
qısır kimidir,
Şeirə havayı gəlib,
gedirlər.

***

Sözümün bir yanı
hara qoyublar
Şeir, sənət kimi
bir gülüstanı?
İlhamsız şairlər
şeirə dolublar
Qara qarğa sanı,
çəyirtkə sanı.

***

Həqiqi şeirlər
yaranır oddan.
Həqiqi şairlər

odla eynidir.
Yalan şairləri
düşürdün atdan
Alın qələmini,
cırın şeirini.
Yaxşı tanıyıram
o kəsləri mən.
Əvvəl öz qınına
çəkiləcəklər.
Sonra qılınc çəkib
mənim üstümə
Qarğa-quzğun kimi
töküləcəklər.

***

Kitab buraxırlar,
tərifləyirlər.
Beləcə bir sürü
şeir dəllalı.
Alverçi dəllala
daha dönüblər
Çoxdu imkanları
çoxdu pulları.

***

Mən yaman cızıqdan
çıxdım kənara.
Neyləyim müqəddəs
mənə şeirdir.
Çoxdan qövr edirdi
sinəmdə yaram.
Bunları yazmasam
ölləm deyərdim.
Mənimçin ən ulu
məbəd, şeirdir.
Məhəbbət, mətanət,
ibrət şeirdir.

## BU MİLLƏT DİLDƏ PƏRGARDIR

Bu millət dildə
pərgardır.
Ondan cəld, zirək
bilmirəm.
Əməldə amma ki,
kaldı.
Haçan dəyəcək
bilmirəm.

***

Haqqı olacaqdır
haçan.
Diliylə işi
düz gəlsin.
Havayı sözündən
qaçıb
İradəsinə güc gəlsin.

***

Nə qədər özün
təriflər,
Şişirdər, şişirdər
şişər.
Haçan yalançı
həriflər
Məşədi olacaqlar
işlə.

***

Bu millət mərdlikdə
çoxdan
Babək nəslinə

məxsusdur.
Amma ki, əməldə
yoxla,
Gör, neçə
faizi düzdü.

***

Batıb boş sözlərdə
gerçək.
Tək başı
görünür ancaq.
Kim ona ağıl
verəcək.
Kim buna çəkəcək
əncam.

***

Nə olar bir yol
tez dursun.
Gözünə eynəklər
taxsın.
Nə olar bir kərə
dursun
Özünə kənardan
baxsın.

***

Nə olar dağılmaz
dünya
Özünə bir kərə
gülsün.
Özünə qayıdar
vallah,
Özündən dayanar
üstün.

***

Özü öz hakimi
olsun.
Özündə tapsın
cəsarət.
Özüylə üz-üzə
dursun.
Özünə versin
hesabat.

***

Çox yazmışıq
zaman-zaman.
Bizdən qəhrəmanı yoxdu.
Yüz yol axtarmışam
amma qəhrəmanlar
hanı yoxdu.

***

Həqiqət yaman
acıdır.
Odur böyük,
odur ulu.
Millət onun
möhtacıdır
Millətə
xilas odur o.

## BİR VAXT İNDİ

Ah sənə necə də
mən inanırdım.
Deyərdim səndəki
ürəyə alqış.

Deyərdim, dedikcə
qürurlanardım.
Allah, sənətkar da
insan olarmış.

***

Şairlər içində
az görməmişdim
Dostunu şöhrətə,
ada satanlar.
Şair ürəyimə
bunlar tanışdı
Məni çox aldatdı
o şarlatanlar.

***

O vaxt yazıçılar
evində idim.
İşləyirdim katib
vəzifəsində.
Orada yazanlar,
pozanlar gördüm
Yüz cürə imanda,
yüz cürə dində.

***

Bir gün dost dediyin
sabahkı günü,
Səninlə olurdu
əməlli düşmən.
Çətindi tanımaq
belələrini
Gəl indi bu
tutqun aləmdə işlə.

***

Bir qoca var idi
hədyan deyərdi,
Hər kimlə rastlaşsa,
hər kimi görsə
Yüz cür otağımda
böhtan deyərdi
Qonşu otaqdakı
oturan kəsə.

***

İçimdə çevrilib
dönərdi halım
Birtəhər özümü
ələ alardım.
Bir kəlmə deməzdim
o ağsaqqala
Baxardım saçına
məəttəl qalardım.

***

Bir toya, mağara
düşmüşdü yolum.
Bir gün sən
çıxdın yolumun üstə.
Sən nələr aparırdın
mağar dopdolu,
Nələr əxz edirdin
o ulu səsdən.

***

Orda tanış olduq
mağar yerində
Bir əziz dostum da
mənimlə vardı.

O yenə dostumdur
            can-ciyərimdir
Mənə həyan olur
            çətində, darda.

***

O nə oxuyandır,
            nə şeir yazan.
Amma dəyişmərəm
            yüz sənətkara.
O Müşfiq ocağını
            yaradan insan,
Deyirəm sən hara,
            o insan hara?!

***

Düzü, yana-yana
            yazıram bunu.
Sən bizim dostluğu
            satdın yadlara
Bitdi dost oyunu,
            qardaş oyunu.
Heyif hədər getdi
            çox-çox aylarım.

***

Hər şey dilindəymiş
            demə, a bədbaxt.
Daha vaxtım yoxdur
            qoşulam sənə.
Heyif qəzəl dedim
            səsinə bir vaxt
İndi tazıyanə
            qoşuram sənə.

***

Nə yaxşı deyirəm,
üz oldu astar.
Nə xiffət edirəm,
nə qəm çəkirəm.
Səni tanıdığım
illərin üstdən.
Bir qalın xətt ilə
qələm çəkirəm.

## HARDASAN ƏVVƏLKİ İNAMIM...

Hardasan, əvvəlki
inamım yenə.
Gəl, yenə başımın
üstündə dayan.
Qayıt, o əvvəlki
gümanım yenə,
O əvvəlki ümid
gözlərimdə yan.

***

Qayıt, ürəyimin
qüdrəti,
Məni gücsüz deyib
salma yəhərdən.
Qayıt, ilk istəyim,
ilk məhəbbətim.
Boylan, bax üzümə
xatirələrdən.

***

Bircə gün gəncliyim,
göstər üzünü.
Görüm toy günümü,

bəylik günümü.
Görüm o sevdiyim
ellər qızını.
O şahlıq günümü,
böyük günümü.

***

Qayıt, qoca anam,
elə sadəcə,
Quruca nəfəsin
gəlsin evimdən.
Yenə sahib olum
əvvəlki gücə
Arxamda dayanıb
dağlar deyim mən.

***

Qardaşım yox idi
bacım mərd, qoçaq.
Qardaş bərabəri
bacımdı mənim.
Yüngül zökəm oldum
qanad açaraq
O saat yanıma
uçurdu mənim.

***

Kaş ki, evimizə
gələydi yenə,
Bəlkə də ölümə
zəfər çalardım.
Bu xəstə vaxtımda
baxaydı mənə.
Bəlkə də, bəlkə də
mən sağalardım.

***

Məni zirvələrə
            qaldıraydılar.
Davam orda qaldı,
            dərmanım orda.
Üstümdə dumanlar,
            altımda dağlar.
Ölümə yazardım
            fərmanı orda.

***

Qayıdın, əvvəlki
            illərim mənim.
Qayıdım, qayıdım
            həyata mən də.
Sizə uzanacaq
            əllərim mənim
Məni mənfur ölüm
            hədələyəndə.

## SÖZ İLƏ GƏLDİM CAHANA

Söz ilə məni doğdu,
Mənim Qızılgül anam.
Söz ilə varid oldum,
Sözlə gəldim bu cahana.
Mən söz ilə boy atdım,
Sözdən-sözə yol açdım.
Axşam söz ilə yatdım,
Sübhü söz ilə açdım.
Ömrüm də bu əzizlə
Əfsanəyə çevrildi.
Döndüm polada sözlə,
Sözlə muma çevrildim.
Sözlə yuxarı qalxdım
Yazdım bir ulu dastan.
Bəzən yaxama taxdım,
Bəzən başımın üstdən.

Nizəm, qılıncım oldu,
Atdım pisə, yamana.
Söz xıncım-xıncım oldu,
Yetməyəndə ünvana.
Çaldım simində cəngi,
Qoydum ucuna neştər.
Oldu nə qədər zəngin,
Keçdi dəmirdən, daşdan.
Oldum sözümə əsgər,
Oldum sözümə rəhbər.
Bu minval ilə sözlə
İllər ilə yol getdim.
Yazdım gecə-gündüzlər,
Sözü-sözə öyrətdim.
Sözlə yaranıb xilqət,
Şübhə buna yox, əsla.
Sözdür əbədi ülfət,
Sözdür əbədi məna.
Qüdrətli söz vallahi,
Bir orduya bənzərdir.
Söz mülkünün Allahı,
Füzuli peyğəmbərdir.
Söz çox dərdin çarəsi,
Söz nə batar, nə itməz.
Gedər xəncər yarası,
Gəl, söz yarası getməz.
O, həmişə yaşar,
Təkcə o ölümsüzdür.
Gec-tez gedəcək nə var,
Qalan əbədi sözdür.

## BƏŞƏRİN ƏN BÖYÜK MÜBARİZƏSİ

Bəşərin ən böyük mübarizəsi
Yaşamaq uğrunda mübarizədir.
Yaşamaq izləyir daim hər kəsi,
Daim bu davayla üzbəüzədir.
Bəşərin ən böyük mübarizəsi

Nə bayraq uğrunda mübarizədir,
Nə millət uğrunda mübarizədir,
Nə torpaq uğrunda mübarizədir,
Nə vətən uğrunda mübarizədir,
Bunlar sonlara gəlir, əsas vuruşlar
Tək gödən üstündə mübarizədir.
Onlar sonra gəlir nə vaxt
insanın
Qarnı dolu olur, süfrəsi
dolur.
Bax, onda vətəni
düşünür insan.
Bax, onda torpaqçın
vuruşur insan.
Bax, onda bayraqçın
vuruşur insan.
Düşünmək bacarmaz
qarnı ac insan.
Bəşərin ən böyük mübarizəsi
Çörək uğrundakı mübarizədir.
Nəinki insanlar
heyvanlar hətta
Yaşamaq uğrunda
vuruşur hər gün.
Güclülər yeyirlər zəiflərini,
Kobudlar məhv edir zəriflərini.
Milyon illərdir ki, yer
kürəsində
Yaşamaq uğrunda davalar
gedir.
İnsanlar həm düşmən
həm də ki, sirdaş,
Necə ki, insanlıq
hələ var, durur.
Bütün davaların
başında qardaş,
Yaşamaq uğrunda
davalar durur.

## ƏDALƏT VƏZİROVA AĞI

Necə yazım, necə deyim,
Heyif, Ədalətə, heyif.
Heyif qızıl barmaqlara,
İndi o kaman ağlayır.
İndi o kaman inləyir,
O, ölüm nədi bilməyir,
O, Ədaləti gözləyir,
Yollarda qalıb gözləri.
Heyif, Ədalətə, heyif,
Birdən-birə oldu qeyib.
Birdən-birə çıxdı, getdi,
Ulduz kimi axdı, getdi.
Əbədi yox oldu, getdi.
Əfsanəydi, nağıl idi,
Soyu mənə yaxın idi.
Atası Səfərəli idi,
Yaxşılıq heykəli idi.
Mahir qarmon çalan idi,
Çalmağı da gözəl idi.
Barmaqları qızıl idi,
Ona çox qulaq asmışam,
Səsin qəlbimə yazmışam.
Ölüm, dad əlindən, aman,
Tanımırsan yaxşı, yaman.
Elə bil qıraqdan tutub,
Yaxşını yamana qatıb,
İtirib namusu, arı,
Aparırsan insanları.
İnsafın olsun, ay zalım,
Mürvətin olsun, ay zalım.
Əməlindən haray, ölüm,
Səni öləsən, ay ölüm!
Daşa dönəsən, ay ölüm!

## TƏBİƏT HAQQINDA

Təbiət de hanı
səndəki vicdan?
Bəzən insaf ilə
iş görməyirsən.
Qalmalı adamı yaşatmayırsan,
Ölməli adamı
öldürməyirsən...
Ey ulu təbiət,
bu nədir, axı,
Gördükcə od qalxır
hərdən başımdan,
Təzəcə dünyaya
gələn uşağı
Məzara qoyursan
bircə yaşında.
Sənə yaxşı deyim,
sənə pis deyim,
Məəttəl qalmışam
bu sirrə inan,
Görürsən, Allahdan
ölüm gözləyən
İflic bir qarını
hey yaşadırsan.
Əvvəl əli açıq
əzizlər kimi
Nura qərq edirsən
bütün bəşəri.
Sonra qəpik güdən
xəsislər kimi
Hər nə vermisənsə
alırsan geri.
Nə var, zərrəbindən
bir-bir keçirib,
Ley kimi şığıyıb
alırsan geri.
Qolun qüvvətini

dizin gücünü,
Gözün işığını
alırsan geri.
Saçın qarasını
alırsan geri,
Səsin əlasını
alırsan geri.
Üzün gülüşünü
alırsan geri.
Allahın dişini
alırsan geri.
Deməli, hər şeyi
baca verirsən,
Deməli, hər şeyi
borca verirsən...
Axı, nə ad verək
buna, təbiət.
Mehriban təbiət,
ana təbiət?
Kim ki, gövşəməkçün
dünyaya gəlib,
Yemini-yalını
bol etmək nədir?
Ürəyi korlara
sağlam göz verib,
Qəlbi işıqlını
kor etmək nədir?
Birinin ağlını
çox eyləyirsən,
Birinin varını
çox eyləyirsən.
Birinin nəfsini
tox eyləyirsən,
Birinin qarnınnı
tox eyləyirsən.
Dolanır başımda
min-min fikirlər,
Niyə cavab versin

illər, əsrlər?
Çox vaxt gözəl olur
içi kifirlər,
Çox vaxt kifir olur
içi gözəllər...
Görürsən, qeyrətli
gəlinə, qıza,
Ömür dostun alıb
kədər verirsən.
Amma bir axmağı,
bir həyasızı
Eyş-işrət içində
əyləndirirsən?
Yumur gözlərini
təmiz, natəmiz,
Sən də hey çiynində
köç aparırsan.
Bütün yaxşıları
vaxtsız, vədəsiz,
Bütün yamanları
gec aparırsan.
Sərtsən, amansızsan,
səxavətlisən,
Təbiət, nə qədər
ziddiyyətlisən?
Anlaya bilmirəm
nə üçün bəzən
Haqqı son mənzilə
çatdırmayırsan,
Dünyanı ələkdən
keçirməyirsən?
Batmalı gəmini
batırmayırsan,
Uçmalı ölkəni
uçurmayırsan,
Asmalı qatili
asdırmayırsan?..
Susmalı alçağı

susdurmayırsan?..
Ey, ulu təbiət
bağışla məni,
Anlaya bilmirəm
təbiətini...

## BİR GÜN DƏ SALAMAT AÇDIM SƏHƏRİ

Bir gün də salamat açdım səhəri,
Bir gün də dünyanı gördüm, min şükür,
Gecəni evimdə yatdım əməlli,
Ürəyim bir gün də vurdu, min şükür...

Qurtuldum bəladan, qəfil ölümdən,
Bir gün də ömrümə ömür calandı.
Bir gün də yaşadım qələm əlimdə,
Bir gün də yazmağa imkan yarandı...

Çəkildi gözümdən zülmət, qaranlıq,
Əqlimi, huşumu sağ gördüm, Allah.
Bir gün də yerimdən qalxıb duranda,
Qohumu, qonşunu sağ gördüm, Allah...

Üç doğma balamın tutdum əlindən,
Bir gün də onların əzizi oldum.
Ömrümün davamı nəvələrimlə,
Bir gün də yaşamaq nəsibim oldu...

Bir daha seyr etdim necə dan sökür,
Günəşi elə bil yenidən gördüm.
Allaha, bəndəyə şükür, min şükür,
Bir gün də dünyanı yerində gördüm...

Bir gün də ömürdür böyük bir ömür,
Onu heç nə, heç nə eyləməz əvəz...
Kim ki, bir gününün qədrini bilmir,
Ayların, illərin qədrini bilməz.

Bir gün də salamat açdım səhəri,
Bir gün də dünyanı gördüm, min şükür...
Bir gün də evimdə yatdım əməlli,
Ürəyim bir gün də vurdu, min şükür...

## GECİKMİŞ MƏHƏBBƏT MAHNISI

Sən gizli gəlmisən ömrümə, inan,
Bu gizli eşq ilə yaşayacağam.
Dünyanın ən böyük yükü sayılan
Gecikmiş məhəbbət daşıyacağam.

Sən mənim ömrümdə açan çiçəksən,
Onu ürəyimdə bəsləyəcəyəm.
Sən məni heç zaman görməyəcəksən,
Mən səni hər zaman gözləyəcəyəm.

Uzaqdan göz qoyub gözünə sənin,
Sanki görəcəyəm Allahımı mən.
Düşüb qarış-qarış izinə sənin,
Əzbərləyəcəyəm yollarını mən.

Səni zərrə-zərrə kəşf edəcəyəm,
Səni milyon kərə kəşf edəcəyəm.
Ərini, oğlunu öyrənəcəyəm,
Rəngini, qoxunu öyrənəcəyəm.

Hər günü adınla başlayacağam,
Hər günü adınla bitirəcəyəm.
Səni röyalarda oxşayacağam,
Səni xəyallarda itirəcəyəm.

Sən məni heç zaman duymayacaqsan,
Mən bütün ömrünü izləyəcəyəm.
Sən mənə məhəl də qoymayacaqsan,
Mən səni həmişə səsləyəcəyəm.
Hər gün mənim üçün doğulacaqsan,

Hər gün mənim üçün yox olacaqsan.
Mənim sevincim də sən olacaqsan,
Mənim kədərim də sən olacaqsan.
Mən sənin adına hər saat, hər an
Qəlbimdə məktublar yollayacağam.
Sən heç vaxt fikrimdən çıxmayacaqsan
Mən heç vaxt yadında qalmayacağam.
Beləcə həsrətlə qocalacağam,
Belə enəcəyəm, ucalacağam.

Keçib hər alovdan, keçib hər oddan,
Böyük əzabından şad olacağam.
Sən mənə həyatda ən doğma adam,
Mən sənə yaddan da yad olacağam.

Sən ömür edəcəksən ayrı adamla,
Mən kiməm, nəçiyəm, bilməyəcəksən.
Bir gün bu dünyadan sənin adınla
Köçüb gedəcəyəm, bilməyəcəksən.

## SONA ÇATAN ƏSRİMİZİN MƏN SONUNCU ŞAİRİYƏM

Mən söz ilə görünərəm, ayrı donda görünmərəm,
Onun, bunun ətəyində sürünmərəm.
Baş əymərəm heç bir kəsin hüzurunda,
Ucalığı əxz etmişəm Füzulidən.
Mən Sabirdən həqiqətə düz baxmağı öyrənmişəm,
Mən Müşfiqdən nakamlığı öyrənmişəm...
Sürülərin arasında görməzsiniz heç vaxt məni,
Hərcayilər sırasında görməzsiniz heç vaxt məni...
Haray çəkən şeirlərin şairiyəm,
Faciəli dövrlərin şairiyəm...
Mən poladam əqidəmdə, əməlimdə,
Dəyişmərəm məsləkimi yer-göy qopsa təməlindən,
Soyulsam da diri-diri,
Tonqallarda yandırardım əqidəsiz şairləri,

Külək kimi ora-bura əsənləri,
Yandırardım yazıqları cəfəng-cəfəng əsərləri...
Mən bir amal, mən bir vicdan şairiyəm,
Para-para paralanmış Azərbaycan şairiyəm...

Olmaz mənə hökm eləmək, əmr eləmək,
Olmaz məni nömrə ilə nömrələmək.
Heç bir rənglə qaralamaq olmaz məni,
Sözdən qeyri heç nə ilə yaralamaq olmaz məni...
Ümidimi kəsmək olmaz qılınc ilə,
Mənim məhvim ölüm ilə gülünc olan,
Mən ölümdən sonraların şairiyəm,
Öz ömründən sonraların şairiyəm...

Gör, nə boyda məmləkətəm,
amma yarı mənim deyil,
Bu diyarım mənimdirsə,
o diyarım mənim deyil...
Torpağımda görün kimlər at oynadır...
Ulu Şuşam indi olub yad oylağı...
Cəh-cəh vuran səsi batıb
Qarabağın,
Bizə qalıb təkcə adı
Qarabağın...
Qırx milyonluq millətim var
azı mənim,
çoxu yadın...
Gecə-gündüz dilimdədir
Təbriz adı,
Qədəmlərim təzə-təzə
dəyir ora,
Bu vüsalın kaş axırı xeyir ola,
Gecə-gündüz bu həsrətin,
bu harayın
şairiyəm...
Həm bu tayın, həm o tayın
şairiyəm,
Məndən sonra kim sürəcək

söz atını
bilməyirəm,
Mən arxamda hələ elə bir adamı
görməyirəm...
Şeirə, sözə daraşan çox,
Şöhrət üçün vuruşan çox,
dalaşan çox,
Amma əsil şairliyə yaraşan az,
Xalq adından danışan çox,
öz adından
danışan az...
Mən bu yurdun şan-şöhrətə
ən biganə
şairiyəm.
Ad-san sevməz tək yeganə
şairiyəm...
Ulu sözün ən sonuncu
şairiyəm.
Sona çatan əsrimizin
mən sonuncu
şairiyəm.

## AĞLA BALA, AĞLAMALI CAHANDIR...

*Nəvəm Təbrizə*

A Təbrizim, suyum, havam, çörəyim,
Sən mənimçin özün boyda sehrsən...
Ağlamaqdır ana dilin hələlik,
Hər sözünü ağlamaqla deyirsən.

Ağlamaqla qarşıladın cahanı,
Ağla, bala, ağlamalı cahandır,
Ağlamaqla istəyirsən ananı,
O getdimi işin ahu-fəğandır.
Ağlayırsan acıyanda, susanda,
Ağla, bala canım sənə sadağa...

Ağla, bala, bu qanundur, bu qayda,
Süd vermirlər ağlamayan uşağa...

Göz yaşıdır yumşaq üzün, sərt üzün,
Tutulursan bir sərt sifət görəndə,
Heç mənim də xoşum gəlmir, Təbrizim,
Elə daim hırtıldayıb güləndən...

Bərkdən hayqır, dönüm sənin gözünə,
Baban kimi fağır olma, amandır.
Ağlamasan baxan olmaz sözünə,
Ağla, bala, ağlamalı cahandır.

Ağlamaqla istəyinə çatırsan,
O haqqındır, tələbindir, balacam...
Beşiyini bir-birinə qatırsan,
Südün, çayın gecikəndə balaca...

Sən nəslimin davamısan, oğlusan,
Ümidimsən, pənahımsan, Təbrizim...
Amma ağır zəmanədə doğuldun,
Nigaranam sabahından, Təbrizim...

Bu da yəqin bəxtin hökmü, işıqdır,
Parçalanmış vətən düşdü payına...
Ağla, bəlkə o tərəf də eşidə,
Bu tərəf də bəlkə qalxa, ayıla...

Haqqı asan verməyirlər heç vədə,
Diş-dırnaqla gərək onu alasan.
Vəsiyyətdir, bu babadan nəvəyə,
Bərkdən hayqır, bərkdən çağla, balası...

Baban kimi səbatlı ol, amma sən,
Baban kimi, fağır olma amandır.
Çox amansız bir dünyaya gəlmisən,
Ağla, bala, ağlamalı cahandır...

## İNSAN HİMNLƏRİ

I

Bu gün dünya çox qəribə
		surətdədir,
Yer də, göy də, təbiət də
		heyrətdədir...
Məişətlər dəyişmədə,
		təfəkkürlər dəyişmədə,
Dünya haqda, varlıq haqda
		təsəvvürlər dəyişmədə,
Ürəkləri bu sinədən
		o sinəyə köçürürlər,
Raketləri göyərçin tək
		ələ alıb uçururlar.
Bircə gündə fəzaları
		bir-birinə qatmaq olur.
Səhər çıxıb axşam Ayda
		yatmaq olur...
Artıq Marsda, Venerada
		hey qalmayıb,
Bir sirr olan şey qalmayıb
Məqribdən çıx Məşriqə get,
		bircə gündə,
Bu dünyanı ziyarət et,
		bircə gündə.
Hey işləyir üfüqlərin
		tramvayı-arabası,
İnsan görüb, nə gündədir
Ayın köhnə xarabası.
Yerdən özgə heç bir yerdə
		yaşamağa güman yoxdur.
Yerdən ayrı heç bir özgə planetdə
		insan yoxdur...
İnsan nədir, heç bir sarı yarpaq

yoxdur...
Yarpaq nədir, heç bir quru tikan
yoxdur,
Yerdən özgə heç bir ümid, heç bir dayaq,
güman yoxdur...

II

Bu gün dünya müasirlik
dövründədir,
Müasirlik çox şeylərin
fövqündədir...
Süni adam yaradılıb,
Süni yemək yaradılıb,
Süni damar, süni böyrək,
süni ürək yaradılıb.
Hesaba çək bircə anda
bu həyatda gör nə olur,
Bu gün tamam təzə olan,
sabah tamam köhnə olur...
Zaman özü köhnəlibdir çox şeyləri
Sokratdan, Eynşteynə qədər,
Təzələnir bütün bəşər.
Təzələnir bütün aləm,
urandan qurğuşuna qədər.
Nəhəng-nəhəng dövlətlərin
quruluşundan,
Görünməyən atomun
quruluşuna qədər...
Dəyişilir çox-çox şeylər,
Zindandan açara qədər,
Qanundan paltara qədər.
Dərmandan zəhərə qədər.
Nağıldan məsələ qədər,
Bombadan çiçəyə qədər.
Havadan yeməyə qədər,
Stildən vəznə qədər,
Torpaqdan ərşə qədər.
Lampadan günəşə qədər,

Cılızdan nəhəngə qədər.
Qızıldan əhəngə qədər.
Varlıdan kasıba qədər,
Məsləkdən mənsəbə qədər.

III

Hər bir şeyin sürət ilə
dəyişdiyi dövrdə mən.
İstəyirəm şeirdə mən,
Hər insanı insan edən,
Hər bir kəsin varlığında yanan, coşan,
üsyan edən,
Milyon illər dəyişməyən
duyğuları vəsf eləyim,
Bu şeirimi mən onlara
həsr eyləyim...
Onlar ilkin pasportudur
hər bir kəsin,
Qoy müasir əsrimizdə
onlar köhnə görünməsin.
Onlar daim təzə qalan
duyğulardır...
Milyon yazdır, milyon yaydır,
milyon qışdır,
Yer şarımız o duyğular üzərində
dayanmışdır...
O duyğular kimdə varsa
adam olur,
Bəşəriyyət o duyğular
toplusudur...

IV

Öz balaca xilqətiylə
hər bir insan,
Bu dünyada bir dünyadır
yaxşı baxsan...
Ən adicə süpürgəçi taleyini

qələm alıb yazsa
əgər,
Dahilərə, dühalara mövzu üçün
bəs eyləyər...
İnsan olmaq ən qüdrətli,
Ən əbədi vəzifədir,
Ən kasıbı, ən yoxsulu,
ən tükənməz xəzinədir...
Ən cılızı nəhənglərin
nəhəngidir,
Ən kifiri bir gözəllik
çələngidir.
Ən yadı da ən doğmadır,
ən mərhəmdir...
Ən bülluru yenə sirli
bir aləmdir,
Yenə sirli bir həyatdır,
Ən sadəsi ən mürəkkəb kainatdır...
O həmişə düşüncədə,
hərəkətdə, həyəcanda,
Bütün aləm işıqlanır
gözlərini o açanda.
Zülmətlər də gülümsəyir
nurlananda eyni onun,
Düşüncələr istəyidir beyni onun.
Ora gündə minlər ilə
fikir gəlir, fikir
gedir...
Hər fikirdə o pətəyə
öz balını tökür gedir...
Öz dadını, şirəsini
qoyub gedir.
Öz rəngini, öz səsini
qoyur gedir...
Radar nədir əsəbinin
qabağında,
Tufan nədir qəzəbinin
qabağında.
Onsuz bütün bu kainat

bir yuxudur,
Ən kəsərli silah insan
yumruğudur,
Ən şəfalı dərman insan
ülfətidir.
Ən əbədi bulud insan
möhnətidir.
Ən qüdrətli muzey insan
məzarıdır,
Ən əbədi sevinc insan
sevgisidir.

## MƏHƏBBƏT HİMNİ

Bu bombalar, bu raketlər
dövründə mən,
Ruhumla mən, qəlbimlə mən,
şeirimlə mən
Ən birinci məhəbbətə baş əyirəm.
Ən birinci məhəbbətə himn
demək istəyirəm...
Bu dünyanın əlifbası –
məhəbbətdir,
Ən ilk nəğmə, ən ilk yazı –
məhəbbətdir...
İlk körpü də, ilk dahi də –
məhəbbətdir,
Yer üzündə ilk abidə –
məhəbbətdir...
Hər gözəllik məhəbbətdən
yaranmışdır...
O, insanın bu həyata gəlişini
xəbər verən,
Ən birinci qaranquşdur,
Ən sonuncu nişanədir...
Məhəbbətsiz bu kainat
viranədir...
Hey yazırlar: bizim əsr Romeolar,

Cülyettalar əsri deyil.
Bizim nəsil Leyli-Məcnun
nəsli deyil.
Hey yazırlar: biz texniki inqilablar
dövründəyik.
Kibernetik maşınların
sehrindəyik.
Sosioloqlar, psixoloqlar
bir-birinə qarışırlar,
İnfarktların, xərçənglərin
növlərindən danışırlar.
Ölümlərin, qalımların
hər cürəsi öyrənilir.
Yüz il ömür sürənlərin
təcrübəsi öyrənilir,
Min-min dərman yaradılıb
əsəb üçün, ürək üçün,
Öz-özünü donduran var,
gələcəkdə bu həyata
dönmək üçün,
Bu arzuyla milyarderlər
Müflisləşib talanmışdır,
Yer üzündə əhalini saya alan
hesablama mərkəzləri
yaranmışdır.
Düşünürəm: bu artıqdır,
bu hədərdir,
Nə qədər ki, sevən vardır
yer üzündə insanlar da,
o qədərdir...
Hesablama mərkəzləri, siz
onları hesablayın,
Məhəbbətin atəşinə yananları
hesablayın,
Siz onların adlarını
elan edin,
Siz onların miqdarını
elan edin,
Sanma, pulla özlərini donduranlar,

Biz yuxuya cuman kəslər diriləcək...
Dirilsə də gözlərini sevgi ilə
Yuman kəslər diriləcək...
Kim sevirsə ən müasir insan odur,
Mənim üçün məslək odur, vicdan odur,
Kim sevirsə, mən onunla dost-sirdaşam,
Kim sevirsə, mən onunla məsləkdaşam...
Mən onların cərgəsində dayanıram,
Ən birinci məhəbbətə inanıram,
Ən birinci sevənlərə inanıram...

## HƏQİQƏT HİMNİ

Həqiqəti deyən adam güclü olur,
Həqiqəti deyən adam uca olur.
Həqiqətin hamar olmur fəqət yolu,
Həqiqətin dili bir az acı olur...
Böyüyü yox, kiçiyi yox həqiqətin,
Riyası yox, bicliyi yox həqiqətin...
Həqiqəti deyən kəslər ürəklidir,
Təpərsizlər el-obanın gülüncüdür.
Elə bütün həqiqətlər gərəklidir,
Elə bütün həqiqətlər birincidir.
Mən görmüşəm...
Kifirlər də mələkləşir
            həqiqəti danışanda,
Mən görmüşəm...
Adicə söz polad deşir
            həqiqəti danışanda...
Fəqət nəhəng məmləkətlər heçə dönür
            yalan ilə barışanda,
Daş saraylar puça dönür
            yalan ilə barışanda,
Müdrik şəxslər gicə dönür
            yalan ilə barışanda,
Düz qayəyə, düz amala
            milyon kərə
            baş əyirəm,

Fəqət yalnız həqiqəti
sona qədər deyənlərə
baş əyirəm...
Yalnız, yalnız mən onlara
baş əyirəm...
Sona qədər düz danışan şeirlərə
baş əyirəm...
Sona qədər düz oxunan mahnılara
baş əyirəm...
Sona qədər düz yazılan qanunlara
baş əyirəm...
Sona qədər düz qoyulan məhvərlərə
baş əyirəm...
Sona qədər düz danışan rəhbərlərə
baş əyirəm...
Sona qədər, sona qədər, sona qədər...
Yoxsa qalan "həqiqətlər" gəldi-gedər...
Həqiqətsiz bir məmləkət, qanundu bu,
Milyonlarla oğlu olsa sonsuz olur...
Həqiqəti deyən ölkə nəhəng olur,
Həqiqəti deyən torpaq sonsuz olur...
Həqiqətin bir yolu –
ya o yanlıq, ya bu yanlıq.
Həqiqəti açıq demək qəhrəmanlıq,
Həqiqəti açıq demək mərdanəlik...
Həqiqətə biganəlik –
öz oduna, ocağına biganəlik,
Öz müqəddəs torpağına –
biganəlik...
Öz dilinə biganəlik,
Öz könlünə biganəlik...
Öz adına biganəlik,
Anasına, atasına,
övladına biganəlik...
Həqiqətsiz ömür eləyən insan deyil,
Həqiqəti demək fəqət asan deyil,
Həqiqəti demək fəqət halva deyil,
Həqiqəti deyənlərə zərbə dəyib,

Həqiqəti deyənlərə şillə dəyib,
Həqiqəti deyənlərə
kürəyindən bıçaq dəyib,
sinəsindən güllə dəyib...
Qızıl qanda yuyunublar
həqiqəti danışanlar...
Dabanından soyulublar
həqiqəti danışanlar,
Kəfən geyib yaşayıblar
həqiqəti danışanlar,
Kişi adı daşıyıblar
həqiqəti danışanlar...
Asılıblar, dağlanıblar
həqiqəti danışanlar...
Tikə-tikə doğranıblar
həqiqəti danışanlar...
Kəsiliblər, sürülüblər,
həqiqəti danışanlar...
Ölə-ölə diriliblər
həqiqəti danışanlar...

## BÜTÖVLÜK HİMNİ

Atomların milyon-milyon zərrələrə
bölündüyü dövrdə mən,
İstəyirəm şeirdə mən
Adamlarda bütövlüyü vəsf eləyəm,
Bu himnimi o duyğuya həsr eləyəm.
Evdə, çöldə bütövlüyü,
Qəlbdə, dildə bütövlüyü,
Ən balaca fikirdə də,
ən qüdrətli duyğuda da
bütövlüyü,
Hörmətdə də, nifrətdə də, qayğıda da
bütövlüyü,
O günəş tək, o ulduz tək bütövlüyü,
Bir yumruq tək, iki göz tək bütövlüyü,

Dəniz kimi, torpaq kimi bütövlüyü,
Millət kimi, bayraq kimi bütövlüyü,
Yoxsa gündə bir sifətlə olanlara
inanmıram,
Gahdan nala, gahdan mıxa çalanlara
inanmıram,
Hətta belə ən müqəddəs yalanlara
inanmıram.
Qənfet kimi şirin-şəkər söhbətlərə,
Gah büzüşən, gah açılan hörmətlərə,
Mərdliyini dincə qoyan kişilərə,
Arvad kimi incə olan kişilərə,
Nə dostluğu, düşmənliyi bilinməyən
vücudlara,
Məhəbbəti mikroskopla görünməyən vücudlara,
Yaxşılıqla yamanlığın arasında
qurdalanan məxluqlara,
Qram-qram, qəpik-qəpik
xırdalanan məxluqlara,
Hey pusquda duranlara,
havadan nəm çəkənlərə,
Üzdə dalğa göründümü
asta dibə çökənlərə,
Külək kimi gah o yana,
gah bu yana əsənlərə
inanmıram,
Kimlə gəldi tez duz-çörək kəsənlərə
inanmıram...
Bu həyatdır enişi var,
yoxuşu var,
Tufanı var,
dolusu var,
yağışı var,
Bu həyatdır aerodrom yolları tək
hamar deyil,
Bu həyatdır məclis deyil, bayram deyil,
şüar deyil,
Bu həyatdır orda bu cür baş girləmək

mümkün deyil.
Baş girləyə-girləyə də ömür eləmək
bir gün deyil,
Bu həyatdır, imtahanı
çoxdur onun,
Bu həyatdır orta yolu
yoxdur onun,
Adam gərək oynamaya,
neçə insan yaşamaya
bir insanda,
Ən dəhşətli faciədir insan durub
insan rolu oynayanda...
Atam vardı... o adama hələm-hələm
can deməzdi,
Bir oğluydum, məni şit-şit məhəbbətlə
istəməzdi,
Mən bir sifət gördüm daim
atamda mən.
Gördüm onda bu sifəti duranda mən,
yatanda mən,
Sakit vaxtı gördüm onu,
dava vaxtı gördüm onu,
Dosta baxdı gördüm onu,
yada baxdı gördüm onu,
Bir sevgidə, bir hörmətdə
bir nifrətdə gördüm onu,
Ay dəyişdi, il dəyişdi,
dəyişməyən
bir sifətdə gördüm onu.
O deyərdi: – İnsan odur bütöv ola,
Hörməti də, nifrəti də bir növ ola,
O deyərdi: bala qurban,
Dad yarımçıq toxumlardan,
Dad yarımçıq vicdanlardan,
Dad yarımçıq insanlardan,
Dad yarımçıq hörmətlərdən,
Dad yarımçıq qeyrətlərdən.

## İLKİNLİK HİMNİ...

Ayın-günün milyon illər
nur saçdığı dövrdə mən,
İstəyirəm şeirdə mən,
Lap ən qədim duyğu olan
ilkinliyi vəsf eyləyim.
Onda olan zənginliyi,
ənginliyi vəsf eyləyim...
Doğulduğun ilk ocağa bağlılığı,
Su içdiyin ilk bulağa bağlılığı,
O ilk qara, o ilk mehə bağlılığı,
Oxuduğun ilk nəğməyə bağlılığı,
İlk sevgiyə, ilk sehrə bağlılığı,
Eşitdiyin ilk şeirə bağlılığı,
İz saldığın ilk cığıra bağlılığı,
Dinlədiyin ilk nağıla bağlılığı,
Varlığımdır, həyatımdır
o balaca,
komam mənim.
O beş qarış saray yurdum,
o qalaca komam mənim.
Qucağında ötüb keçdi taleyimin
ilk illəri,
Adı gəldi, yada düşmür doğmalarım,
ilkinlərim.
Yada düşür məndən sonra
torpaq olan əzizlərim,
İlhamıma həmişəlik
dayaq olan əzizlərim.
Yada düşür məsafəcə bir az mənə
gen düşənlər,
Yada düşür yaşıdlarım saçlarına
dən düşənlər.
Yada düşür Sürahilər, Gülpərilər
Xalidələr,
Kəndimizin qəbirləri...
ilk gördüyüm

abidələr.
Yada düşür... məndən sonra qarı olan
analarım.
İsmət adlı bir tükənməz varı olan
analarım,
Siz idiniz, ey analar, mənim üçün
ilk sevgilər, ibadətlər,
necəsiniz?!
Necəsiniz, ilk gördüyüm birmərtəbə
imarətlər,
necəsiniz?!
Necəsiniz, ilk gördüyüm yüz mərtəbə
qayalıqlar
necəsiniz?!
Sizi məndən ala bilməz ən dəhşətli
ayrılıqlar,
necəsiniz?!
İlkinliyim... adın gəldi
varlığıma səda düşür,
Kəndimizdə ömür sürən o kişilər yada düşür.
Mənim babam, mənim atam,
mənim dayım,
onlar idi...
Ağlım bir şey kəsən gündən ilk Allahım
onlar idi...
Kişilikdən danışmazdı,
kişi kimi yaşamağı bacarırdı
o kişilər.
Nə kiçiyin qabağında böyüyərdi,
Nə böyüyün qabağında alçalardı
o kişilər...
Dar ayaqda Allah gəlsə dediyindən
dönməzdilər...
Səmimi ol, başlarını kəs onların
dinməzdilər...
Günah etdin... eyham ilə tənbeh edib,
döyərdilər...
Hər kəlməni inam kimi, amal kimi

deyərdilər...
Hər yetənin süfrəsində çörək yeməz,
Əldən su içməzdilər
o kişilər...
Qorxaqlığı oğlu nədir, qızına da
keçməzdilər o kişilər.
Mən onların hörmətini
sakit gördüm, sözsüz gördüm...
Mən onlarda bir dil gördüm,
bir söz gördüm...
Nə dostluqdan nitq eləyər,
nə də tez-tez şərəfinə içərdilər.
Dost yolunda haysız-küysüz
ən sonuncu tikəsindən keçərdilər.
Tikə nədir, övladından keçərdilər.
Övlad nədir, həyatından keçərdilər.
Mən onlarda nə bir yüngül
hörmət gördüm,
qulluq gördüm...
Mən onlarda bir "hə" gördüm,
bir "yox" gördüm...
Bir mərama inandılar ölənəcən,
Bir məqsədlə dayandılar ölənəcən,
Başdan-başa namus idi, amal idi
o kişilər...
Doğruluğa, etibara heykəl idi
o kişilər...
Nə yaxşı ki, mən onların nəvəsiyəm,
balasıyam,
Dünya dönsə məhvərindən mən onların
tərəfində qalasıyam.
Nə yaxşı ki, mən onların ocağında
doğulmuşam.
Nə yaxşı ki, mən onların
xəmirindən yoğrulmuşam.
Nə yaxşı ki, mənim atam, mənim əmim
onlar olub...
Nə yaxşı ki, ilk inamım, ilk aləmim

onlar olub...
İlkinliyim, ilkinliyim...
Mənim yerim, mənim göyüm...
Ən əbədi ehtiyacım...
Babam, atam, anam, bacım...
Bu dünyaya səpilən ilk məhəbbətim.
Sadəliyim, qaynarlığım, təravətim,
Sünilikdən, təkəbbürdən uzaq eşqim,
Ən birinci vətən sevgim, torpaq eşqim,
Yeddi arxam, yeddi nəslim,
Qanım-rişəm, kököm, əslim,
Qəlbim, ruhum, gözüm, əlim,
Həm axırım, həm əvvəlim,
Mənim nəğməm, mənim şeirim,
mənim dilim – ilkinliyim!
Sən varsansa,
yoxdur ölüm, ilkinliyim!

## TƏBİİLİK HİMNİ

Bu robotlar, süni əllər, süni gözlər
dövründə mən,
İstəyirəm şeirimdə mən,
Təbiiliyi vəsf eyləyim,
Bu himnimi o duyğuya
həsr eyləyim...
Deyirəm ki, adam odur
təbii ola,
Qoy lap onun insan kimi
səhvi ola.
Qoy lap onun günahları
min-min ola,
Təbiilikdə ən dəhşətli nöqsanları
yox eləmək mümkün olar.
Deyirəm ki, adam odur
təbii ola,
Büllurdan da aydın, təmiz qəlbi ola,

Soyumağı öz yerində,
odlanmağı
öz yerində,
Bozarmağı öz yerində,
utanmağı öz yerində.
Kobudluğu öz yerində,
zərifliyi öz yerində,
Cəsarəti öz yerində,
zəifliyi öz yerində.
Təbii ola, arzu kimi,
əməl kimi təbii ola.
Təbii ola çiçək kimi,
xəzəl kimi təbii ola.
Lap dünyanın ən mürəkkəb
sirlərini biləndə də,
Yüz-yüz əsr bundan sonra
olanları görəndə də,
Coşanda da, daşanda da,
güləndə də, küsəndə də,
Şan-şöhrəti qarış-qarış
yer üzünü gəzəndə də.
Fikrində də, ruhunda da,
qəlbində də, dilində də,
Lap ən sakit vaxtında da,
lap ən çətin günündə də.
Lap yüz yaşlı olanda da,
Bir millətin ağsaqqalı,
Bir ölkənin dövlətbaşı
olanda da,
Təbii ola gərək insan:
Körpəlikdən ta gözünü yumanacan.
Ta ən axır arzuyacan
həvəsəcən,
Ta ən axır nəfəsəcən,
Baxışacan, duruşacan,
görüşəcən,
Ta sonuncu nəğməyəcən,
gülüşəcən,
Təbii ola, təbii ola,

təbii ola,
Bu robotlar, süni əllər, süni gözlər
dövründə mən,
Ruhumla mən, qəlbimlə mən, şeirimlə mən.
Ey insanlar, hamınızı
çağırıram
təbii yola!
İnsan odur itirməyə kövrəkliyi,
ürkəkliyi,
Varlığından fəğan qopan
ley vuranda
bir kəkliyi,
Bir adicə qarışqanı,
sərçəni ölmüş görəndə
Bir körpənin yanağında
yaş görəndə,
Daşa bilə, dola bilə,
Adam onda
əsil adam ola bilər.
Gözlərinə baxan zaman,
Görəsən ki, insandı bu, xalis insan,
Hər nəyi var özünündür,
Ürəyində nə qədər ki, istəyi var
özünündür.
Baxışında nə qədər ki,
kədəri var, gülməyi var
özünündür.
Sir-sifəti özünündür,
Bütün ömrü, bütün günü,
bütün yaşı özünündür.
Hər bir sözü, hərəkəti
mən insanam deyir onun,
Heç bir şeyi quraşdırma deyil onun.
Nə daxilən, nə xaricən
çürükdür o,
Nə bir şaqqa ət deyildir,
nə bir yığın
sümükdür o.
Bir həyat var deməsində,

gülməsində,
Qan qaynayır damarında,
ürək vurur sinəsində.
Üz tuturam uşaqlara, böyüklərə,
nəsillərə,
Üz tuturam hələ sabah göz açacaq
əsrlərə,
Söyləyirəm təbii olun, təbii olun,
Alimlərin fikri olun,
şairlərin təbi olun.
Kiçik adlar, böyük adlar
təbii olun,
Ey ilhamlar, istedadlar
təbii olun.
Ey fəhlələr, ey nazirlər
təbii olun.
Üzü yeni, içi köhnə müasirlər
təbii olun.
Vəzifədə əyləşənlər,
adamların taleyinə qol çəkənlər,
Raketçilər, aya, günə
yol çəkənlər,
Təbii olun, insan odur
təbii ola, təbii ola.
Bu robotlar, süni əllər, süni gözlər
dövründə mən,
Ruhumla mən, qəlbimlə mən,
şeirimlə mən.
Ey insanlar, hamınızı çağırıram
təbii yola!

## İNAM HİMNİ

Ən müasir silahların çoxaldığı
dövrdə mən,
İstəyirəm şeirdə mən,
İnam adlı qədim, köhnə bir duyğunu
vəsf eyləyim...

Bu himnimi onun böyük qüdrətinə
həsr eyləyim.
Düşünürsüz siz bəlkə də,
Bu əsərdə inam nədir?!
Hey yelkənən, hey köklənən raketlərlə
bir cərgədə,
Axı, inam nə gərəkdir?!
Axı, onun nə canı var,
axı onun nə səsi var...
Nə bir sınıq tüfəngi var,
nə bir qırıq gülləsi var...
Güllə nədir, heç adicə qırması yox,
Bir kimsənin ondan azca qorxusu yox...
Nə karədir, odlu qazlar yanında o...
Nə karədir neytronlar yanında o...
Bircə bomba bəs eyləyər
milyon adam qırmaq üçün,
O köhnəlmiş bir ümiddir
insan üçün, torpaq üçün,
Bəlkə elə deyirsiniz oyansınlar:
İnam adlı boş bir şeyin kölgəsində
yatan varsa...
İnam nədir, raket varsa, atom varsa?!
İnam nədir aləm silah bazasıyla
dolan yerdə?!
İnam nədir, qorxunc hərbi komandanlar
olan yerdə...
Bəlkə elə deyirsiniz əsr inam
əsri deyil...
İnam uran yüklü deyil,
inam bomba səsli deyil...
Mən deyirəm: bu dünyanın
ilk rəhbəri inam olub.
Mən deyirəm:
Bu dünyanın ən birinci
rəncbəri inam olub...
Mən deyirəm:
Hər vicdanın ilk meyarı
ilk ölçüsü – inam olub...

Mən deyirəm:
Bu dünyanın ən birinci
            əkinçisi inam olub.
Mən deyirəm:
Bu dünyanın ən birinci
            duz-çörəyi inam olub.
Mən deyirəm:
Bu dünyanın ilk gözəli,
            ilk mələyi – inam olub.
Mən deyirəm:
Bu dünyanın ən birinci
            sərkərdəsi – inam olub...
Mən deyirəm:
Bu dünyanın ilk silahı,
            ilk gülləsi inam olub...
Mən deyirəm:
Bu dünyanın ilk paytaxtı – inam olub...
Mən deyirəm:
Bu dünyanın ən birinci
            kosmonavtı – inam olub...
İnam verin, bu dünyanı məhvərindən
            silkələyim,
İnam verin, ən qüdrətli orduları
            kölgələyim,
İnam verin, qırım bütün şübhələri,
            bəlkələri,
İnam verin, yıxım bütün zorbaları,
            yekələri.
İnam verin, çin eyləyim,
            çin olmayan gümanları.
İnam verin, söküm bütün
            məhbəsləri, zindanları.
Yıxılana inam verin,
            yeriyənə inam verin...
Dağ inamı olana da,
            yenə-yenə inam verin.
Dünya nəhəng bir dəryasa –
            inam ada,

Bəzən mənə elə gəlir,
İnamlılar azalmada,
            inamsızlar çoxalmada.
İnam dostum, inam anam,
            inam atam...
İnamını itirəndə ölür adam,
Dönüb soyuq bir ət olur.
Nə onda bir məslək olur,
            nə onda bir qeyrət olur...
Yoxdur böyük, kiçik inam,
Bəzən nəhəng bir dəryada
            boğulana bir çöp inam,
Əsil şair vətəninin
            inam dağı...
Ailəyə inam olur
            bir körpənin
            doğulmağı...
Mən inamdan yaranmışam,
            yoğrulmuşam...
İnam olub ürəklərdə
            bitəcəyəm.
Mən inamla bu dünyada
            doğulmuşam,
Mən inamla du dünyadan
            gedəcəyəm.

## AZƏRBAYCAN

Anamızın matəminə buraxmadılar,
Bacımızın toyu oldu – gedə bilmədik.
Yüz yol şəxsi işimizi varaqladılar,
Təqsirimiz, günahımız nədi – bilmədik.

Burda ata gözlərini yumdu əbədi,
Orda oğul gedib görə bilmədi yası...
Oğul nədir, quş bu yana səkə bilmədi,
Ordan bura nə yoldu ki – qaş-göz arası.

Fədailər güllələndi, şəhidlər öldü,
Cənub yandı, şimal yandı – nəşələndilər.
Bir millətin məni öldü, mənliyi öldü,
İki yerə parçalandı – nəşələndilər.

Ruhlar getdi, eşqlər getdi, mənalar getdi,
İllər keçdi ömrümüzə qəm səpə-səpə...
O tərəfdən bölük-bölük sonalar getdi,
Bu tərəfdə göllərimiz tutmadı xəbər...

Yad çəkmələr tapdaladı ana torpağı,
Çəpər-çəpər, ağac-ağac bölüşdürdülər.
O tərəfi bu tərəfə etdilər yağı,
Bu qardaşı o qardaşa vuruşdurdular.

Nə gördülər ilan kimi çəkdilər dəmə,
Çox yerlərdən qaralayıb sildilər bizi.
Bu qanunlar, qadağalar imiş demə,
Sonra qanlı məftillərlə böldülər bizi.

Yüz cür bəzək düzəltdilər zahirdən, üzdən,
İçəridən qarət edib soydular bizi...
Bir də gördük ayrılmışıq öz kökümüzdən,
Bir də gördük itirmişik kimliyimizi...

Bir də gördük, yalan dönüb həqiqət olub,
Bir də gördük, yadlar kimi söhbət edirik...
Bir də gördük, millət ayrı bir millət olub,
Birdə gördük, yavaş-yavaş məhvə gedirik...

Bir də gördük, qızlarımz miskinləşiblər,
Bir də gördük, bizdən deyil gəlinlərimiz...
Bir də gördük, yollarımız özgələşiblər,
Yad ciblərə axıb gedir gəlirlərimiz...

Bir də gördük, öz adını dəyişir çoxu,
Təbliğ edir yad ruhunu, yad ədasını...
Bir də gördük, analar yad balalar doğur,
Bir də gördük, oğul danır öz atasını...

Burda çara baş əyirlər, şaha o yanda,
Bəzisi də nə ondandır, nə bundandırlar.
Bir də gördük, bu sathasat yarışlarında,
Bizimkilər öncüldürlər, çempiondurlar...

Bağlayıblar xalq qəlbinə gedən yolları,
Görə-görə ağ üstündən qara çəkirlər.
Haqq danışan, birlik deyən ər oğulları,
Burda tutub, orda isə dara çəkirlər.

Bir də gördük, adi quru söz olub vətən,
Başımızda təkcə onun sevdası qalıb...
Sarı palıd ağacı tək sozalıb vətən,
Budaqları sınıb düşüb, gövdəsi qalıb.

Gördük çoxu öz-özünü düşünür ancaq,
Məslək pula, vəzifəyə qurban verilir.
Bir də gördük xalq olubdu əldə oyuncaq,
Onu tarac edənlərə ənam verilir.

Gecə-gündüz qardaş-bacı haraylı olduq,
Nə ağrılar, nə acılar gördü bu torpaq...
Röyalarda ta o taylı, bu taylı olduq,
Röyalarda gördük daha birdi bu torpaq...

Bu ikili tale ilə barışdıq daha,
Bu millətin hər bir şeyi oldu yarımçıq.
Parçalandı yeri, göyü, adı, allahı,
Dirisi heç, ölüsü də öldü yarımçıq...

Yarı əsdi şimal-cənub küləyimiz də,
Toy elədik, yas saxladıq – yarımçıq oldu...
Düz ikiyə ayırdılar ürəyimizi,
Bölündükcə, üzüldükcə yarımcan olduq...

Daha olduq yarı məhrum, yarı da azad,
Bir vətəndə iki vətən qürbət olarmı?
Düz deyiblər, dad yarımçıq əlindən, min dad,
Heç yarımçıq millətdən də millət olarmı?

Açıldılar ərzin zülmət yolları belə,
Bəşər oğlu düz Allahın evinə uçdu.
Hətta qarı düşmənlər də verdi əl-ələ,
Təkcə bizim taleyimiz düyünə düşdü...

O qitədən bu qitəyə gəlib-getdilər,
Bütün uzaq məsafələr yaxınlaşdılar...
Hətta ağlar qaralarla dostluq etdilər,
Çox tayfalar, əsabələr yaxınlaşdılar...

Hətta vəhşi heyvanlar insafa gəldi,
İsinişdilər azimanlar, qurdlar, tülkülər.
Hətta təzə dostlar kimi əl-ələ verdi,
Bir-birini qılınclayan ellər, ölkələr...

Cənub çıxdı yerin-göyün cazibəsindən,
Günahımız, qüsurumuz nədi – bilmədik.
Sən buna bax, lap az qala iki əsrdə,
Bir qarışqa gedən yolu gedə bilmədik...

Gedəmmədik qatar oldu, təyyarə oldu,
Beş qarış yol tilsimlərə düşdü elə bil.
Təbriz ərzin ən əlçatmaz şəhəri oldu,
Təbriz ayrı planetə köçdü elə bil...

2

Təbriz nədir, Naxçıvana sərhəd qoydular,
Mərənd nədir, Biləsuvara gedə bilmədik.
Aramıza yüz qadağa, yüz səd qoydular,
Günahımız, təqsirimiz nədi – bilmədik...

Xiyabani o tərəfdə silah götürdü,
Onu ölüm yatağında dağ elədilər.
Pişəvəri bu tərəfə pənah gətirdi,
Burda onu hiylə ilə yox elədilər.

O tərəfdə Firudini tutub asdılar,
Bu tərəfdə Biriyanı məhkum etdilər.
Sərhədlərə say-hesabsız qoşun basdılar,
Gündən-günə məftilləri möhkəm etdilər...

Hətta suya, hətta göyə sərhəd çəkdilər,
Ayırdılar dil-ağızsız dərəni, dağı.
Ağacları qopararaq tirlər əkdilər,
Yer altına, yer üstünə atdılar lağım...

Qoymadılar bu tərəfə bir arı qona,
Xətkeş kimi düzəltdilər əyri xətləri.
Adicə bir yarpağın da xışıltısına
Saatlarla durub hürdü sərhəd itləri...

O tərəfdən bir durbinlə bizə baxdılar,
Bu tərəfin durbinləri yüz adda oldu.
O tərəfin çəpərləri köhnə taxtadan,
Bu tərəfin çəpərləri poladdan oldu...

Bir keçilməz sıldırıma, qayaya döndü,
Bu torpağın baş yolları, ulu yolları.
Düz ortadan haçalandı, iki bölündü,
At yolları, qurd yolları, quru yolları.

Sıçovullar donub qaldı zülmət deşikdə,
Qartallara göy olmazdı süzə ilahi.
İllər boyu ayıq-sayıq durub keşikdə,
Bizi durub qorudular bizdən, ilahi...

O taydakı qardaşına məktub yazanın,
Kağızına, markasına əmma qoydular.
Bir yol Təbriz radiosuna qulaq asanın
Tamam yeddi arxasına əmma qoydular.

– Sən iclasda pis apardın o gün özünü,
Mərənd, Şahbuz sözlərini ürəkdən dedin.
Nəyə isə eyham vurdun Cənub sözüylə,
Həm də qardaş kəlməsini çox bərkdən dedin.

– Olmaya sən itirmisən tamam ağlını,
Sən ünsürsən, sən düşmənsən, milli qalıqsan.
Öz dilinlə özün açdın öz paxırını,
Bundan belə Sibirliksən, Kalımalıqsan...

Gündə dartıb apardılar sorğu-suala,
Döyüb-söyüb, əzab verib saldılar əldən.
Göndərdilər sürü-sürü soyuq şimala,
Guya xalqı qurtardılar millətçilərdən.

Azərbaycan bir açıqca zindana döndü,
Millətçilər kim idi ki, – Cavid əfəndi.
Namərdləri sağ qaldılar, mərdləri öldü,
Müşfiq, Cavad, Abbas Mirzə, Ruhulla, Ülvi...

Hətta böyük Nərimana qulp qoydular,
Kim azacıq boy göstərdi, boynu vuruldu.
Bizim vətən sevgimizə qoruq qoydular,
Bizim vətən məramımız qorxulu oldu...

3

Qırx altıda ümidlərin çırağı yandı,
Xəzəl olmuş bağımıza güllər açıldı.
Birləşməyə iynə boyda güman yarandı,
Bir-birinə həsrət qalan qollar açıldı.

Bir balaca gözümüzün yaşını sildik,
Elə sandıq biz istəyən zamana gəldi...
Heç olmasa az da olsa Təbrizi gördük,
Elə bil ki, dinə gəldik, imana gəldik...

Heç olmasa bir azacıq Mərəndə baxdıq,
Ərdəbilə ayağımız dəydi balaca...
Savalana zirvələrə girəndə baxdıq,
Dumanına papağımız dəydi balaca...

Bir azacıq ruhumuzda tərpəniş oldu,
Bir az qəflət yuxusundan oyandı xalqım...
Heç olmasa beş günlüyə azad quş oldu,
Odlar görmüş həm o yanlı, bu yanlı xalqım...

Heç olmasa əhval tutub danışa bildik,
Öz doğmaca qardaşımla bir lisanda biz.
Heç olmasa gəzə bildik, dolaşa bildik,
Bu dünyanın cənnət bağı Gülüstanda biz...

Bütün aləm xəbərdardı fəraqımızdan,
Beş günlüyə bu fəraqın çıxdıq yasından.
Heç olmasa çat-çat olmuş dodağımızla,
Axır gedib öpə bildik Ərk qalasından.

Xətainin ruhu coşdu, Qurbani güldü,
Dirilər də, ölülər də cana gəldilər.
Heç olmasa axır Culfa Culfanı gördü,
Astaradan Astaraya salam verdilər.

Allahsız da əllərini qaldırdı göyə,
Dedi: – bunu gəl, çox görmə sən bizə, Allah...
Heç olmasa, heç olmasa beşcə günlüyə,
Böyük Bülbül cəh-cəh vurdu Təbrizdə, Allah...

Heç olmasa, heç olmasa, ah, heç olmasa...
– Dedilər yox, sizlər hara, birləşmək hara?..
Yenə körpə ümidlərə çəkildi hasar,
Bu sonuncu cəhdimiz də dəydi daşlara...

Yenə girdi ortalığa fəsad, şər, hiylə,
Yenə düşdü aramıza hicran, qəm, küsü,
Stalinin, Mikoyanın fitnəsi ilə
Qovladılar, çıxartdılar o taydan bizi.

Çıxartdılar, qovladılar özgələr təki,
Yuxarıdan hökm gəldi, sən hökmə bir bax...
Bilə-bilə qoymadılar, qoymadılar ki,
Bütöv vahid millət olaq, bir yerdə olaq...

Qorxuludur hər millətin bütövü, tamı,
Millət batır, millət itir parçalananda...
Bilə-bilə qoymadılar, qoyardılarmı
Möhtəşəm bir dövlət olsun Azərbaycanda?

Onda, axı, özgələri cılız görünər,
Niyə, axı, Azərbaycan olsun o boyda?
Qoca Şərqin qapısında nəhəngə dönə,
Bir ucu Dərbənddə dursun, bir ucu Xoyda...

Qoymaq olmaz pərvazlansın bir ölkə kimi,
Başqaları unudulsun, kölgədə qalsın.
Qoy ikiyə parçalansın əvvəlki kimi,
Hər parçası bir dövlətdə, ölkədə qalsın...

Niyə, niyə Azərbaycan bir olsun, axı,
O birləşsə güclü olar, xətalı olar...
O Qafqazda ələ alar hegemonluğu,
Hətta onun BMT-də adamı olar...

O birləşsə qalxar, axı, dirilər, axı,
Qoy yenə də əvvəlki tək getsin yuxuya...
O birləşsə çoxlarına olar göz dağı,
O birləşsə çoxlarına meydan oxuyar...

Birləşməyə qoymaq olmaz Azərbaycanı,
Nahaq yerə bölməyiblər onu qədimlər.
Şah ilə çar, çar ilə şah o zaman, canım,
Nə ediblər düz ediblər, doğru ediblər...

... Böyük rəhbər əl gəzdirdi bığına bu dəm,
Haramzada casusları düşdülər işə...
Cənub-şimal çalxalandı, dəyişdi aləm,
Yenə hicran ilə gəldi döş-döşə...

Bığlarına əl gəzdirdi “sevimli” rəhbər,
Azərbaycan viran oldu yenə təzədən...
Beriyanın casusları yelə döndülər,
Yüyürdülər Moskvadan ta Təbrizəcən...

Yenə sərhəd məftilləri verdi səs-səsə,
Döndü cənub tərəfimiz yenə qalaya...
O yanda dar ağacları bu yanda isə
Beriyanın cəlladları girdi araya...

O yanda şah qırıb tökdü, bu yanda rəhbər,
O yanda göz görə-görə, bu yanda pünhan...
Bəlkə də mən yanılıram, bəlkə də səhvəm,
Mən ki, azca ayırmıram rəhbəri şahdan...

İkisi də cəllad olub, qantökən olub,
Formaları ayrı olub, məzmunu eyni.
Bu dünyada say-hesabsız hökmran olub,
Hamısı da bir-birinin davamı, eyni...

Bir-birinin əllərinə su töküb onlar,
Bir-birinə oxşayıblar əkizlər kimi...
İndi odlu cəhənnəmdə kül olub onlar,
Evlər yıxan, qanlar tökən iblislər kimi...

Bığlarına əl gəzdirdi sevimli rəhbər,
Keçirtdilər hamımızı qıl körpüsündən...
Böyüyə də, kiçiyə də əl gəzdirdilər,
Çoxu hətta şübhələndi öz kölgəsindən...

Markaryanlar, topuridzelər meydan suladı,
Yenə xalqı xəlbirləyib ələklədilər.
Kimlərə ki, dördgöz azca barmaq buladı,
Birbaş dəniz qırağına sürüklədilər...

Əllərinə imkan keçdi yenə "yanların",
Yenə onlar "hifz elədi" millətimizi...
Baltanın da sapı bizim, özü onların,
Bax, beləcə ləkələdik millətimizi...

Bax, beləcə özümüzə kəsildik qənim,
Olduq miskin, fağır, yazıq, qorxaq, təpərsiz...
Biz ta kənar düşmənləri neynirik, canım,
Öz "doğmaca" düşmənimiz saysız, qədərsiz...

Bəs eyləyər hələ ayrı millətlərə də,
Biz özümüz həm ov olduq, həm silah olduq.
Özümüz həm qoruq olduq, həm də ki, bərə,
Özümüz həm nişan, həm də nişangah olduq...

Azərbaycan tarac oldu, öldü, dirildi,
Lap az qala öz adı da çıxdı yadından...
Ən mötəbər satqınlara ənam verildi,
Onlar hər gün nitq elədi millət adından...

Yadlar yenə bu ölkəyə durdular yiyə,
Gecə-gündüz malım, mülküm, varım daşındı.
Öz dilində xalq sözünü deyə bilməyən,
Od yağdırdı, at oynatdı xalqın başında...

Bircə kərə bu torpaqda hava udmayan,
Kəslər gəlib bu torpağın darğası oldu.
Azərbaycan kəlməsini dili tutmayan
Azərbaycan millətinin ağası oldu...

Gəncə adı dəyişildi, ar oldu bizə,
Nizamilər, Məshətilər qəşş elədilər.
Beyləqanda bircə tikan əkməyən kəsə,
Beyləqanı başdan-başa bəxş elədilər...

Məscidləri dağıtdılar traktor ilə,
Qədim, ulu abidələr viranə oldu.
Stalinin kitabları ta bundan belə
Bizim xalqın dini oldu, quranı oldu.

Dəyişdilər dəfni, yası, adəti, toyu,
Səsim, ünüm, hay-harayım qaldı içimdə.
Qədim Novruz bayramımız – familim, soyum,
İllər ilə həbs edildi xalqın içində.

Familimdən diksindim də hərdən elə bil,
Amma qəlbən qürurlandım Novruz gələndə.
Hamı gizli bayram etdi Novruzu hər il,
Plov asdı, xonça tutdu bu əziz gündə...

Bir yandan da dağıtdılar tariximizi,
Əsər yazıb nəşr etdilər hey qalaq-qalaq.
Neçə-neçə kitablardan sildilər bizi,
Neçə-neçə millətə etdilər yamaq...

Yazdılar ki, kor olmuşuq inqilabacan,
Quru yurdda böyümüşük bu günə qədər.
Bundan belə bağımızda çiçəklər açar,
Bundan belə bizimkidir gələcək zəfər...

Bir rəhbərə sağ ol deyək günəş çıxanda,
Gərək ona yaşa deyək səhər gələndə.
Ona, ona minnətdarıq pambıq yığanda,
Ona, ona minnətdarıq güllələnəndə.

O günəşdir, o səhərdir, ulduzdur, aydır,
Odur əsil xilaskarı bu elin, yurdun.
Guya bizim rəhbərimiz o olmasaydı,
Nə Nizami doğulardı, nə Dədə Qorqud.

Nə çayımız su verərdi, nə də arxımız,
Nə ətimiz dad verərdi, nə də yağımız.
Nə önümüz görünərdi, nə də arxamız,
Nə solumuz bilinərdi, nə də sağımız.

Ona dua etməliyik hər saat, hər gün,
Cəh-cəh vuran bülbül üçün, açan gül üçün.
Ona, ona minnətdarıq Koroğlu üçün,
Kəpəz üçün, Göy göl üçün, Maral göl üçün.

Bəli, ona minnətdarıq, biz ona təkcə
Bir gecədə minlər ilə qeybə çıxançün.
Bəli, ona minnətdarıq, biz ona təkcə
Bu "şən", "azad", bu yarımcan Azərbaycançün.

4

Şəhriyarın yubileyinə buraxmadılar,
Səhənd öldü hüzuruna gedə bilmədik.
Yüz yol şəxsi işimizi varaqladılar,
Günahımız, təqsirimiz nədi, – bilmədik...

Üzeyir bəy gözlərini yumdu əbədi,
Uzaq-uzaq ellər gəlib gördü bu yası.
O tərəfdən bir quş belə səkə bilmədi,
Biz də kimi qanlı tutduq – yazıq Arazı.

Biz də əsil günahları unudub elə,
Durub düşdük gecə-gündüz bir çayın üstə.
Göz yumaraq bu taydakı vətənsizlərə,
Yıxdıq bütün günahları o tayın üstə...

Guya tamam ac-yalavac İrandır ora,
Burdakılar qəndə, bala batıb az qala.
Guya tamam xarabadır, virandır ora,
Burdakılar kommunizmə çatıb az qala...

Çox qalmayıb, lap az qalıb, neçə gün qalıb,
Üzəcəyik başdan-başa süd gölündə biz.
Yatırdılar tərif dolu laylalar çalıb,
Şüar ilə yuxuladıq, qalxdıq gündə biz.

Şüar, şüar tin başında, addım başında
Şüar ilə çay içdilər, qazan asdılar.
Meşələrdən, səhralardan, dağlar başından
Xərabələr üzərində şüar asdılar.

Ulu rəhbər şüarların kökü, zəngini,
Ulu rəhbər şeirlərdə, tərcümələrdə.
Şüarların ən şənini, ən qəşəngini
Zindanların üzərinə pərçimlədilər.

“Ta çatıbdır ömrümüzün ən xoş çağları,
Lap az qalıb, kommunizmin kəndarındayıq”...
Dustaqlarsa şüarlara baxdı, ağladı,
Düşündülər, bəs biz kimin qandalındayıq?..

İnandı da bu hay-küyə hələ çox adam,
Bu boyda da yalan olmaz dedik hər halda.
Ha gözlədik – o böyük gün gəlib çıxmadı,
Gözləməkdən gözümüzün kökü saraldı.

“Lap az qalıb”– görünməyən illərə döndü,
Hey uzandı dadsız, acı bağırsaq kimi.
Nə əvvəlli, nə də bunun sonu göründü,
Camaatı aldatdılar bir uşaq kimi.

“Lap az qalıb” məsafəsi çox uzaq oldu,
İntizarla üzdük elə öz canımızı...
Üç qoyuna, beş qoyuna töycü qoyuldu,
Yun olmadı – apardılar yorğanımızı.

Ellərin də güzəranı qaldı Allaha,
Necə yazım – qaradan da o yana rəng var?
Keçi neçə çəpiş doğub – aldılar saya,
Mülkədara tay tutdular kimdə inək var...

Əkinçini ayırdılar öz torpağından,
Torpaq oğlu torpağından uzağa düşdü.
Ümumi ev, ümumi yol, ümumi dükan,
Qədim Bakı bağları da ümumiləşdi.

– Bağ sahibi, bağını ver, yükünü yüklə,
– Bu bağ sənin bağın deyil, xalqındır daha...
O quyular, üzümlüklər, o əncirliklər,
O cənnətlər viran olub dağıldı daha.

Xalq deyildi bağ sahibi, zəhmətkeş insan?..
Arvadı da, uşağı da özüydü xalqın.
Bax, beləcə həyat çıxdı öz məcrasından,
Bax, beləcə ümidləri üzüldü xalqın.

– At sahibi, ver atını kolxoza hökmən,
Ümumidir geyim-keçim, çörək də, yağ da...
Bax, beləcə talan olduq ümumiliklə,
Qaldıq ətsiz, yağsız, qəndsiz əsrin bu vaxtı...

– Tor sahibi ta Xəzər də ümumi oldu,
Ta balıq da, ta kürü də ümuminindir.
Bəs kiminçün balıqçılar balıq tuturdu,
Dəryamız var, balıqları görünmür indi...

Guya hər şey ümuminin əlinə keçdi,
Amma dərdlər, amma qəmlər oldu xüsusi.
MVD-lə NKVD-lər xüsusiləşdi,
Zülm edənlər, həbs edənlər oldu xüsusi...

Bircə-bircə rəsmiləşdi bütün canilər,
Tuthatutlar, bashabaslar mindi qanuna.
Hər gün artan, balalayan dustaqxanalar
Keçdi mənfur Beriyanın ixtiyarına...

Oldu şəxsi mülkiyyəti, şəxsi dövləti,
Hökmdarlar nə karəydi onun yanında?..
Zindanları Sibirəcən uzandı getdi,
Əlləri də gecə-gündüz insan qanında.

Bütün qayda-qanunlar da oldu boş kağız,
Ölkə tamam, məcrasından uzağa düşdü.
Yazdıq, dünya yaradırıq bəysiz, ağasız,
Həqiqətdə hər kasıba beş ağa düşdü...

Yazdıq, cahan viranədir, tamam viranə,
O gərəkdir qüvvə ala, güc ala bizdən.
Hələ cənub sərhədləri dursun bir yana,
Sərhəd çəkdik dünya ilə öz aramızda...

Ta çoxları qapımızı açammadılar,
Nə kimsəyə salam verdik, nə salam aldıq.
Bir ölkəni başdan-başa açarladılar,
Baş açarı Stalinin cibində qaldı...

Dedik, cahan daha bizdən başlayır, bizdən
Bircə gilə həyat yoxdur bizdən o yana.
Bahar kimi çiçəklidir xəzəlimiz də,
Hətta günəş çox soyuqdur bizdən o yana.

Bizsiz solub-saralacaq ərzin qalanı,
Nə qış qışdır, nə yay yaydır bizdən o yana...
Bizə qədər nə yaranıb nahaq yaranıb,
Gərək heç nə olmayaydı bizdən o yana...

Gündə-gündə yamanlayıb söydük dünyanı,
Bircə gilə vecinə də almadı dünya.
Adətiylə hərlədi öz dəyirmanını,
Öz işindən, öz gücündən qalmadı dünya.

Bizləri də bala-bala vurdu dişinə,
Bizləri də əzdi, sıxdı, silkələdi o.
O – dünyadır, vardı dünya, olacaq yenə,
Öz xalqları, millətləri, ölkələriylə...

O bizə də qəh-qəh çəkdi, bizə də güldü,
Möhkəm-möhkəm ipimizi eşdi bu dünya...
Gözümüzü açıb gördük, bir də nə gördük,
Baxıb gördük ta bizdən də keçdi bu dünya...

5

Bu yay bizi heç Şuşaya buraxmadılar,
Orda Vaqif poeziya günləri idi.
Ağdamdaca bizə tanklar yaraqladılar,
Bu nə qədər ağlamalı, gülməli idi.

Silahlanmış hərbçilər bələdçi oldu,
Təhlükənin, səksəkənin keçdik cənginə.
Burdan Şuşa qalasına qırx ağac yoldu,
Yol kəsmişdi ermənilər – ərəbzəngilər...

Deyin, adam durub kimə şikayət etsin,
Bu boyda da ağır bəla, pis gün olarmı?
Vətəninə əsgər səni müşayiət etsin,
Şair üçün bundan böyük nisgil olarmı?

Ay əsgərlər, necə edək, siz deyin barı,
Bir tərəfdən torpağına silah daşına.
Bir yandan da çox sevdiyin vətən daşları
Yad əllərdə güllə olub yağsın başına...

Nəsə bizə dəymədilər, qaldıq qazanca,
Rəhm elədi bizə vətən daşları məncə...
Kaş əllərim quruyaydı bunu yazınca,
Kaş gözlərim tutulaydı bunu görüncə...

Hava boyu vertolyotlar gəzirdi tək-tək,
Göy yolları açıq idi Şuşaya yalnız.
Az qalırdı yarıb çıxa sinəmi ürək,
Qayıdırdım o dağlardan ruhsuz, inamsız...

Qayıdırdım dağlar kimi dalğın, mükəddar,
Yol bağlıydı Xankəndinə, Kərkicahana...
Neçə kərə bu torpağı bölüşdürdülər,
Neçə kərə təpik dəyər Azərbaycana...

Bəxtimizi neçə kərə acılayarlar,
Soyumuzu ona-buna edərlər calaq...
Neçə kərə bu milləti parçalayarlar,
Öz doğmaca torpağından edərlər calay...

Bir olsa da əsli, nəsli, rişəsi, kökü,
Həqiqətdən, nəsiblikdən mayası ola.
Neçə kərə bir yalını bölərlər iki,
Onun neçə göz dikəni, yiyəsi olar?..

Neçə kərə nemətini yeyib doyarlar,
Daraşarlar onun cənnət guşələrinə?..
Neçə kərə dənizinə qoruq qoyarlar,
Neçə kərə doğrayarlar meşələrini?..

Dönür geri bəd illərin dumanı yoxsa,
Astaraya döndərirlər Şuşanı yoxsa.
Ya Türkmənçay dərdlərini təzələyirlər?..
Yoxsa Dağlıq Qarabağı Xoy eləyirlər?..

Nə tufanlar gəldi keçdi üzərimizdən,
Aylar, illər ağır-ağır tərpəndi getdi.
Baxa-baxa qopardılar Təbrizi bizdən,
Baxa-baxa bir də gördük Dərbənd də getdi.

Yersiz gəldi, yerli daha yükünü yüklə,
Başımıza nələr gələr, nələr bilmədik...
Kəmərlini kimlər o vaxt böldülər iki,
Gədəbəydən kim pay verdi – xəbər bilmədik...

6

Dava təzə qurtarmışdı... dərədə, düzdə,
Yerdə-göydə hələ barıt qoxusu vardı.
Hələ xofu getməmişdi ürəyimizdən,
Canımızda hələ onun qorxusu vardı...

Hələ axıb gəlirdilər “qara kağızlar”,
Poçtalyonlar hamısını gətirməmişdi...
Övladları qayıtmayan ana yazıqlar,
Hələ tamam ümidini itirməmişdi.

Əsgərlərin əynindəydi hərbi köynəyi,
Patrondaş da bağlayanlar var idi tək-tək...
Kartoçkayla verirdilər hələ çörəyi,
İndi əti, yağı, qəndi verdikləri tək...

Hələ çox-çox dərindəydi davanın kökü,
Ağrıları dolaşırdı damarda, qanda.
Hələ faşist əsirləri göz yaşı töküb,
Təzə-təzə gedirdilər Azərbaycandan...

Bizimkilər Almaniyadan dönürdü geri,
Yenə doğma yurdlarına tapınırdılar.
Evlərinə çatar-çatmaz o bədbəxtləri,
Heyvan kimi boğazlayıb aparırdılar.

Öz doğmaca torpağında həbs edirdilər,
Yad torpaqdan əsirlikdən qayıdanları.
Guya onlar vətəninə qəsd edirdilər,
Yaşamağa haqqı yoxdur əsla onların.

Milyon-milyon ömür yedi yırtıcı dava,
Gör nə qədər günahsızın qanı töküldü.
Guya düşmən az qırmışdı bizi Xudaya,
Bir yandan da öz əlimiz qırıb tökürdü...

Qanımızla qurtarmışdıq bəşəri dardan,
Amma hələ içimizdə gedirdi dava.
İrəvanda, Zəngəzurda, Zəngibasarda,
Vedimizdə, Göyçəmizdə gedirdi dava...

Yox, bu dava daha pisdi, inanın buna,
Yox, davada düşmən ilə döyüşür insan.
Burda qonşu basıb səni yük qatarına,
Çıxarırdı öz halalca torpağımızdan...

Min hiyləylə tədbir töküb qovlayırdılar,
Guya qərib əzizləri qayıdır geri...
Bölük-bölük, sürü-sürü qovlayırdılar,
Ulu rəhbər guya buna göstəriş verib...

Lap az qala günahkara döndərib bizi,
Alırdılar ixtiyarı öz əllərinə.
Gözəl-gözəl yaylaqlardan endirib bizi,
Tökürdülər odlu Muğan düzənlərinə...

Deyirdilər, başlı başın saxlasın daha,
Bu şoranlıq düzlər hara, o dağlar hara?!
Bircə qurtum bulaq suyu ömürdən baha,
Bircə udum dağ havası gəlməz xəyala...

Necə oldu o süzmələr, qaymaqlar, yağlar,
Köçkünlərə görün necə od vururdular?
Bircə-bircə ölürdülər yazıq uşaqlar,
Qızdırmaya, yatalağa tutulurdular.

Yaşlılar da qırılırdı dərdi əlacsız,
Bu da bir cür qətl olurdu, edam olurdu.
Orda qədim qəbiristanlar qalırdı başsız,
Burda təzə məzarlıqlar peyda olurdu...

Burda təzə başdaşları doğulurdular,
Qalanırdı, yüklənirdi qəm qəmin üstə.
“İrəvanda xal qalmadı”... oxuyurdular,
Xal nədi ki, İrəvanda nə qaldı bizdən?..

“İrəvanda xal qalmadı” qədim İrəvan,
Xanlıqlardı bir zamanlar başdan-başa o.
Çoxu bizcə danışardı axıcı, rəvan,
Mehribandı dost, tanışa, yar-yoldaşa o...

Bağçaları xalı kimi toxuyardılar,
Dağa-daşa səs düşərdi təranəmizdən.
“İrəvanda xal qalmadı” oxuyardılar,
İrəvanda xal qalmadı, nə qaldı bizdən?..

Gənclərimiz əhd-peyman bağlayardılar,
Baxıb həsəd aparardı pislər, xəbislər...
“İrəvanda xal qalmadı” – çağlayardılar,
İrəvanda xal qalmadı, qəm qaldı bizdən...

İrəvanda xal qalmadı, əbədi qaldı,
Orda ulu əcdadların ruhu, qəbiri...
Orda min-min arzumuzun məbədi qaldı,
Qaldı bizim ömrümüzün izi, ləpiri...

İrəvanda xal qalmadı, əbədi qaldı
Xatirəmiz, nisgilimiz, gözümüz orda...
Aramızda başı qarlı dağlar ucaldı,
Bir-birinə yağı oldu dostlar axırda...

7

Məni dağlar öz qoynundan buraxmayırdı,
Deyirdilər, demək sən də atırsan bizi.
Anam isə hey boynumu qucaqlayardı,
Tutulurdu, kövrəlirdi, dolurdu gözü...

İlk dəfəydi ayrılırdım mən ondan, axı,
Cin ürkərdi köhnə, taxta çamadanımdan.
Hələ ana uşağıydım, ana uşağı,
Yüküm nimdaş – ayaqqabım, şərfim, papağım...

Şeir ilə nəfəs alır, qanadlanırdım,
Poeziya məcnunuydum, dəlisi idim.
Xəyallarım Düratlarım, Qıratlarımdı,
Çox sehrli bir aləmə tələsiyirdim...

Qırx səkkizdə axır mən də şəhərli oldum,
Pedməktəbdə tanış olduq elə o zaman...
İlk baxışdan görən kimi ona vuruldum,
Mən Xızıdan gəlmiş idim, o İrəvandan...

O şəhərli qızı idi, mən dağlar oğlu,
O inciydi, zərif idi, mən yonulmamış.
İlk zəng oldu, hamı birdən sinifə doldu,
Yadlar durub bir-biriylə oldular tanış...

O axırda gəlib çıxdı, gördüm ki, Tanrı,
Yerişini itiribdir utandığından.
Tez yığışdı dövrəsinə Bakı qızları,
Hərə bir şey sual edib, soruşdu ondan...

O, qızların hüzurunda çaşdı, duruxdu,
Bir sadəlövh, bir günahsız uşaqdı sanki...
Qara saçlar ilahidən buruq-buruqdu,
Ala gözlər bir sehrli bulaqdı sanki.

Mən anamın gözlərindən başqa dünyada,
Heç bir zaman o cür şəffaf göz görməmişdim...
Kəndimizdə qızlar vardı namuslu, sadə,
Amma heç vaxt bu həyada qız görməmişdim...

Görməmişdim, yəqin heç vaxt görməyəcəkdim,
Həyatımın axırına, sonuna kimi...
İllər boyu mənə yandı, qayğımı çəkdi,
Bir vəfalı ömür dostu, bir ana kimi...

Sonra bildim qaçqındılar, tavansızdılar,
Bizə qonşu olanların ovudu onlar.
Sonra bildim yurdsuzdular, ünvansızdılar,
Sonra bildim İrəvandan qovulub onlar...

Bir dəhşətli heyrət hissi yarandı məndə,
Elə bil ki, azıb qaldım duman içində.
Pedaqoji məktəb varmış ana dilində,
Bağlayıblar, dağıdıblar bir an içində.

Mən sonralar başa düşdüm düzü bunları,
Tutularmış hər kimsənin cınqırı çıxsa...
Ulu rəhbər rəhm eyləyib özü onlara,
Sürürlərmiş hamısını Sibirə yoxsa.

Sonra bildim yüz minəcən azərbaycanlı,
Qədim, ulu torpağından olub didərgin.
Mən sonralar bu dəhşəti anladım, qandım,
Səfurayla evimizə köçdü bu dərd də...

Sonra gördüm, sonra bildim ötdükcə zaman,
Kirayədə yaşayırlar Mirzəağada.
Ailədə altı qız var, tək bircə oğlan,
Qaldıqları quşxana ev ürək dağıdır.

Stol altda, pəncərədə yatır körpələr,
Ər-arvad da bir-birlərin görmürlər əsla.
Krantlardan ayda, ildə bir yol su gələr,
Tarakanlar ədəb-ərkan bilmirlər əsla.

... Olurmuşlar İrəvanın düz ortasında,
Dörd tərəfdə Azərbaycan məhəllələri...
Köçürtdülər elə günün günortasında,
Köçürtdülər – necə gəldi buna əlləri.

Sonra gördüm altı qızın hamısı göyçək,
Sonra gördüm altı qızın hamısı xallı.
İrəvanda xal qalmadı, de mənə görək,
İrəvanda xal qalmadı, onda nə qaldı?

Ataları atam oldu – Hüseyn kişi,
Ermənicə qurtarmışdı məktəbi yazıq...
Sanardım ki, peyğəmbərin burnundan düşüb,
Aqronomdu... qəlbi varlı, cibləri kasıb...

İrəvanda min dil ilə aldatmışdılar,
Demişdilər... Bakıya get, gözləyir evin.
Bakıda da başına min oyun açdılar,
Gündə bir cür cəfəng deyib, yalanlar deyib.

Zülm çəkdilər xırda qızlar, körpə cücələr,
Üstləri yorğan görmədi, başları yastıq.
Bir gözüylə yazıq kişi uzun gecələr,
Rəhbərlərə elə ümid naməsi yazdı.

Birisi də sayıb cavab vermədi ona,
48-dən aylar ötüb, sənələr keçdi.
Yenə bizim Güllü xanım ev verdi ona.
Güc-bəlayla min doqquz yüz altmış üçdə.

Yazıq kişi nə yaxşı ki, ev görə bildi,
Heç olmasa həyatının qoca çağında...
Əbədilik mənzilində uyuyur indi,
Böyük qızı Səfuranın qonşuluğunda.

Anaları anam oldu – Səriyyə ana,
Özü də tünd seyid idi Mirabbas qızı.
Səxavətli Tanrı hər şey vermişdi ona,
Gözəl idi, boy-buxunu, qaməti, gözü...

Nəcibliyi, insanlığı qədərsiz, saysız,
Daşqəlblinin dəyməz idi qəlbinə belə...
Sözü, mehri, məhəbbəti rəngsiz, qalaysız,
Nur dolardı ayaqları toxunan yerə.

Qızlar hamı çəkmişdilər analarına,
Səfuraydı ilk övladı, canı-ciyəri.
Ana eyzən bala idi, bala da ana,
Sanardın ki, köhnə çinar təzə göyərir.

Yağı düşmən kəsilsə də zəmanə ona,
Hərdən-birdən qımışdı o, gözləri güldü.
Heç olmasa toy elədi balalarına,
Heç olmasa oğul evi, qız evi gördü.

Tanrı bir vaxt öz əliylə hördüklərini,
Öz əliylə viran qoydu, Tanrını gör bir.
Bir zamanlar səxavətlə verdiklərini,
Peşman olub ondan aldı geriyə bir-bir...

Yumaq kimi əyirdilər sərt illər onu,
Laxlatdılar qamətini sanki qəsd ilə...
Bir vaxt gözəl qiyafədə görənlər onu,
İndiysə görsəydilər tanımazdılar.

Yorulmuşdu keçmişlərin Sonası indi,
Kürəyində qocalıq tək yük daşıyırdı.
On beş nəvə, yeddi övlad anası indi
Dörd divarın arasında tək yaşayırdı.

Nə etmişəm eşqin ilə etmişəm ancaq,
Gör ki, neçə aydır, ildir, sənədir xalqım...
Allahımsan, İlahimsən dünya durunca,
İlk xitabım, son sözüm də sənədi xalqım...

8

Adın ilə bu dünyaya doğulmuşam mən,
Adın ilə bu dünyaya göz yumacağam...
Südün ilə, xəmrin ilə yoğrulmuşam mən,
Sənsən ancaq bu dünyada tək umacağım...

Sən daimi nicat yolum, sənsən son dayaq,
Sən Leylisən, bir Məcnun tək həsrətindəyəm.
Yalnız səni birləşdirmək arzusundayam,
Yalnız səni birləşdirmək həsrətindəyəm...

Sənsiz mənə bütün dünya nəfəssiz, soyuq,
Lalam, karam sən içimdə qurulmayınca.
Nə yaşamaq, nə də ölmək ixtiyarım yox,
İkiləşmiş Azərbaycan bir olmayınca.

Yetər, qəflət yuxusuna getməyin yetər,
Yetər, sən də qalxmalısan, ayılmalısan.
Alır bir-bir öz haqqını xalqlar, ölkələr,
Sən də xalqlar arasında sayılmalısan.

Haqqı asan verməyirlər döyüşmək gərək,
Döyüş, vuruş, daha növbən çatıbdı xalqım...
Deyirlər ki, o ayılmaz, yatıbdı bərk-bərk,
Ölən vaxtı ayılacaq, yatıbdı xalqın.

Bu sözləri nifrətimlə lənətləyirəm,
Bu sözlərdə qəzəb də var, həqiqət də var.
Yenə sənə qalx deyirəm, oyan deyirəm,
Oyanıbdır ən balaca ölkələr, xalqlar.

Daha bizim yelkənləri yelləyir külək,
Nə zamandı bütün dillər kilidli idi.
Yetmiş ildi millət demək, xalq adı çəkmək,
Əsil mərdlik, qəhrəmanlıq, igidlik idi...

Bu əsəri azca əvvəl yazsaydım əgər,
Tutardılar bir adicə sözümdən məni.
Varaqlara kibrit alıb od tökərdilər,
Salardılar camaatın gözündən məni.

Eh, indi də bəlkə onu buraxmadılar,
Köhnə, qorxunc zərrəbinlər işləyir hələ.
Qorxa-qorxa oxudular, varaqladılar,
Bəd illərdən miras qalan şübhələr ilə.

Bu sətirlər amma mütləq doğulmalıydı,
Qopmalıydı gözlərimdən, bəbəklərimdən.
Ürəyimdən kağızlara dağılmalıydı,
Qətrə-qətrə çıxmalıydı iliklərimdən.

Misra-misra, vergül-vergül, sözbəsöz, xətt-xətt,
Onlar mütləq göz açmalı, doğulmalıydı.
Çatmalıydı millətimə, xalqıma mütləq,
Heç olmasa xalq qəlbində dərc olmalıydı.

– Diqqət, diqqət... alman xalqı bəyanat verir,
Bütün ərzin ekranları göstərir bu dəm.
Tarix özü bu birliyə zəmanət verir,
Mən də bərkdən əl çalıram, alqış deyirəm.

– İki Berlin bir məcrada axır, çağlayır,
Axır insan dəryaları insanın üstə,
Bir yandan da ruhum əsir, könlüm ağlayır,
Elə bil ki, duz səpirlər yaramın üstə.

Mən baxıram bu üzlərə sevinc içində,
Bir gör necə qucaqlaşır almanla alman.
Elə bil ki, yüz-yüz ocaq yanır içimdə,
Bəs sən nə vaxt qardaşına qovuşacaqsan?..

Qırx dörd ilə dözmədilər almanlar amma,
Bəs sən, əsr yarım keçib necə dözürsən?
Uyuyuram, anam Təbriz girir yuxuma,
İkiləşmiş Astaramız durur gözümdə.

Parçalanmış Culfa çökür sinəmə bərk-bərk,
O tay, bu tay möhkəm-möhkəm tutur yaxamdan.
Kür quruyur, sal odlanır, solur gül-çiçək,
Savalana od tökülür sinə dağımdan.

Nə qədər ki, parçalanmış bir diyarım var,
Gülməyəcək göz doyunca, ürək doyunca...
Nə yaşamaq, nə də ölmək ixtiyarım var –
İkiləşmiş Azərbaycan bir olmayınca...



## MÜNDƏRİCAT



### Şeirlər

**Poemalar**

Buraxılışa məsul: *Əziz Güləliyev*

Texniki redaktor: *Rövşən Ağayev*

Tərtibatçı-rəssam: *Nərgiz Əliyeva*

Kompyuter səşifələyicisi: *Rəşad Həmidov*

Korrektor: *Bətul Eyvazlı*

Yığılmağa verilmişdir 29.04.2004. Çapa imzalanmışdır 18.11.2004.
Formatı 60x90 $^{1}/_{16}$. Fiziki çap vərəqi 18. Ofset çap üsulu.
Tirajı 25000. Sifariş 172.

Kitab "Şərq-Qərb" mətbəəsində çap olunmuşdur.
Bakı, Aşıq Ələsgər küç., 17.